DOI: https://doi.org/10.36719/2706-6185/16/5-12

**Səidə Ələskər qızı Əhmədova**
Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi
"Vətən İdman Liseyi" PHŞ
pedaqogika üzrə fəlsəfə doktoru
ehmedova_126@mail.ru

# "ŞUŞA İLİ" VƏ ŞAGİRDLƏRİN HƏRBİ - VƏTƏNPƏRVƏRLİK TƏRBİYƏSİ

**Xülasə**

Məqalədə Azərbaycanda şagirdlərin hərbi-vətənpərvərlik tərbiyəsinin mahiyyəti, əsas məqsədi, şagirdlərdə dövlət hakimiyyətinə hörmət, Vətənə məhəbbət, vətənpərvərlik hisslərinin ahəngdar təzahürü olan şəxsiyyətin inteqrativ keyfiyyəti kimi vətəndaşlığın formalaşdırılması və millətlərarası ünsiyyət mədəniyyəti araşdırılmışdır. Şagirdlərdə hərbi-vətənpərvərliyin keyfiyyəti kimi formalaşmasında həm müəllimlərin, valideynlərin, ictimai təşkilatların subyektiv səyləri, həm də cəmiyyətin fəaliyyətinin obyektiv şərtləri - dövlət quruluşunun xüsusiyyətləri, hüquqi, siyasi, mənəvi səviyyəsi ilə müəyyən edilməsi diqqətə çatdırılmışdır.

***Açar sözlər:*** *şagirdlər, hərbi-vətənpərvərlik, tərbiyə, orta məktəb, müəllimlər, valideynlər, ictimai təşkilatlar*

**Saida Alaskar Ahmadova**
Ministry of Science and Education of the Republic of Azerbaijan
"Vetan Sports High School" PHSH
doctor of philosophy in pedagogy
ehmedova_126@mail.ru

## "Shusha year" and the military patriotic education of students

**Abstract**

In the article, the essence and main purpose of the military-patriotic education of students in Azerbaijan, the formation of citizenship as an integrative quality of the personality, which is a harmonious manifestation of patriotic feelings and respect for state power, love for the Motherland in students, and the culture of inter-ethnic communication were investigated. It has been brought to attention that the formation of military-patriotism in students as a quality is determined by the subjective efforts of teachers, parents, public organizations, and the objective conditions of society's activity - the characteristics of the state structure, legal, political, and moral level.

***Keywords****: students, military-patriotism, education, high school, teachers, parents, public organizations*

## Giriş

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2022-ci ilin ölkəmizdə "Şuşa ili" elan olunması haqqında sərəncam imzalamışdır. Sərəncamda deyilir: "Qarabağın tacı olan Şuşa xalqımız üçün müqəddəs və əziz məkandır. Şuşa sevgisi hər bir azərbaycanlının mənəvi varlığının ayrılmaz parçasıdır.Şuşa şəhəri zəngin inkişaf yolu keçmiş, Azərbaycanın və bütün Cənubi Qafqazın mədəni və ictimai-siyasi həyatında müstəsna rol oynamışdır. Bənzərsiz tarixi görkəmini və formalaşdırdığı özünəməxsus mühiti həmişə qoruyub saxlayan bu şəhər yetirdiyi böyük şəxsiyyətləri ilə ədəbi, mədəni, elmi və ictimai fikir salnaməmizə əlamətdar səhifələr yazmışdır.

Haqq işi naminə apardığımız 44 günlük Vətən müharibəsində rəşadətli Azərbaycan Ordusu Şuşa şəhərini 2020-ci il noyabrın 8-də işğaldan azad etdi. Ermənistanın kapitulyasiyasına yol açan Şuşa qalibiyyəti xalqımızın qəhrəmanlıq ruhunun təntənəsinə çevrilərək, tariximizə Zəfər Günü kimi həkk olundu. Azərbaycanın mədəniyyət paytaxtı elan edilən Şuşada bu gün şəhərin əsl tarixi simasının bərpası yönündə nəhəng layihələr gerçəkləşdirilir. Şuşa sürətlə dirçələrək əvvəlki dolğun mədəni həyatına qovuşmaq yolundadır" (1).

Həmin tarixi əhəmiyyətli Sərəncamı rəhbər tutaraq Azərbaycan Respublikasının Təhsil Nazirliyi "Şuşa İli" ilə bağlı Bakı məktəblərində keçiriləcək tədbirləri müəyyənləşdirib. "Şuşa İli" ilə bağlı Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tədbirlər planı təsdiq edilib. Adı çəkilən tədbirlər planına əsasən "təhsil müəssisələrində "Şuşa İli" ilə bağlı silsilə tədbirlərin, "Zəfər" olimpiadasının keçirilməsi, məktəblilər arasında "Əziz Şuşa, sən azadsan!", "Şuşa - Qarabağın döyünən ürəyi" mövzularında inşa yazı müsabiqəsinin təşkili nəzərdə tutulur. Həmçinin UNESCO Assosiativ Məktəblər Şəbəkəsinə üzv olan təhsil müəssisələrinin, "Qardaşlaşmış məktəblər" təşəbbüsünə qoşulmuş yerli və xarici ölkə məktəblərinin "Şuşa İli" ilə bağlı birgə tədbirlərinin keçirilməsi planlaşdırılır. Bundan əlavə, Şuşada yaşamış görkəmli şəxsiyyətlərin həyat və yaradıcılığına həsr olunan tədbirlər təşkil ediləcək, yuxarı sinif şagirdləri arasında Şuşanın 270 illik yubileyinə həsr olunan "Ən yaxşı elektron təqdimat" müsabiqəsi keçiriləcək. Məktəb kollektivlərinin, "Şuşada bir gün" respublika fənn olimpiadaları qaliblərinin, ümumi təhsil müəssisələri şagirdlərinin Şuşa şəhərinə səfərlərinin, Şuşada yay məktəblərinin, könüllülər düşərgələrinin təşkili nəzərdə tutulur" (2).

Bununla da Azərbaycan məktəblilərində hərbi-vətənpərvərlik tərbiyəsi yüksək mənəviyyata malik şəxsiyyətin formalaşmasında əsas rol oynayır, möhkəm əqidəli, dəyişməz sosial mövqeyi olan bir şəxsiyyət, əsil fədakar,qəhrəman, vətənpərvər Azərbaycan vətəndaşı yetişir. Vətənpərvərlik şagirdlərdə mənəvi sərvətə çevrilib onlarda Vətənə məhəbbət, qürur və sədaqət, Azərbaycan tarixinə hörmət hissləri formalaşdırır. Bununla da gənc nəsildə Vətənin rifahı naminə ictimai fəallıq, habelə Azərbaycanı yağı düşməndən müdafiə etmək və milli orduda xidmət etmək istəyi daha da güclənir.

Məlum olduğu kimi, "vətənpərvərlik (yunan dilindən patris - ata yurd) mənəvi və siyasi prinsip, sosial hissdir, məzmunu vətənə məhəbbət, ona sədaqət, onun keçmişi və bu günü ilə fəxr etmək, xalqın maraqlarını qorumaq istəyidir." Leksik mənada vətənpərvərlik sözü "Vətənə məhəbbət, Vətənə, xalqa sədaqət" deməkdir.

Gördüyümüz kimi, bu təriflərdə əsas diqqət şəxsiyyətin vətənə müxtəlif münasibətlərinə verilir. Amma bu münasibətləri yalnız mənəvi hisslərə bağlamaq olmaz. Onlar daha geniş məna kəsb edir və fərdin müvafiq ehtiyac-motivasiya sahəsini, onun vətənpərvərlik şüurunu və davranışını özündə ehtiva edir ki, bu da öz məcmusunda vətənpərvərliyi mənəvi keyfiyyət kimi xarakterizə edir.

Məktəblilərin vətənpərvərlik tərbiyəsi şagirdlərin vətənpərvərlik keyfiyyətlərinin, münasibətlərinin formalaşması və inkişafı, aktiv vətəndaş fəaliyyətinə hazırlıq üçün şərait yaratmağa yönəldilmişdir. Məktəblər şagirdlərdə vətənpərvərlik dünyagörüşü formalaşdırır, məktəblilərin milli, vətəndaş şüurunun inkişaf etdirir. Qəhrəman Azərbaycan əsgərinin Şuşaya sıldırım qayalıqlardan daxil olması, ancaq yüngül silahlarla - bıçaq, tapança, avtomatlarla, çox zaman əlbəyaxa halda döyüşməsi, yaralıları və şəhidləri çiyinlərində döyüşə-döyüşə sıldırım qayalarla şəhərə daxil olması, əməliyyatda ağır artilleriyadan istifadə olunmaması şagirdlərdə qürür, fəxarət, qorxmazlıq yaradır. Vətənin müdafiəsinə hazırlığın formalaşmasına yönəlmiş pedaqoji vəziyyətlərin yaradılması, qazilərlə görüşlərin keçirilməsi vətənpərvərlik hissinin inkişafına yönəlmiş əməli fəaliyyətlərin işlənib hazırlanması, həyata keçirilməsi mühüm rol oynayır.

Məktəblilərin vətənpərvərlik tərbiyəsinə dair çoxlu materiallar bu hissin inkişaf etdirilməsi yollarına həsr edilməlidir. Şuşanın qəhrəmanlıq tarixi, doğma şəhərin keçmişi ilə, maraqlı faktlarla tanışlıq, köhnə fotoşəkillərə və videolara baxmaq şagirdlərdə keçmişə maraq və doğma şəhəri ilə fəxr hissi oyadır. Bura muzey dərsləri, yaddaş saatları, veteranlarla görüşlər, axtarış işləri daxildir.

Estetik istiqamət - məktəblilərə bədii zövq aşılayan yazıçıların, musiqiçilərin, həmvətənlərin yaradıcılığında Şuşa mövzusunun öyrənilməsi, ədəbi gecələr,Şuşa döyüşlərinin iştirakçılari ilə görüşlər, Şuşanın muzeylərinə səyahətlər; ekoloji istiqamət Şuşanın təbiətinə, xarı bülbülə diqqətli münasibət tərbiyə edir.

Mövzu istiqaməti yeniyetmələrin vətəndaş və vətənpərvərlik tərbiyəsinin məqsədlərini müəyyən edir. Yeniyetmələrin vətənpərvərlik tərbiyəsi motivasiya, inam, tədris formalarını əhatə edir. Təhsil Nazirliyi gənclərin milli ruhda, vətənpərvərlik ruhunda, ənənəvi dəyərlər əsasında tərbiyə olunmasını, onların yaxşı oxumaları, bilikli, savadlı olmaları, ölkənin tarixini yaxşı bilmələri, antiazərbaycan dairələrinin təsiri altına düşməmələrini qeyd edir : "Hesab edirəm ki, bu istiqamətdə, xüsusən ailədə və təhsil sistemində aşağıdakı prioritet məsələlərə diqqət artırılmalı, vətənpərvərlik tərbiyəsi sahəsində qazanılmış tarixi təcrübə daha da inkişaf etdirilməli, tərbiyə işi qloballaşan dünyanın müasir çağırışlarına cavab verməli, ölkənin iqtisadi, siyasi, sosial inkişafı ilə ayaqlaşmalıdır. Təhsil sistemində tərbiyə işinin səmərəli təşkili, bu sahənin dinamik və davamlı inkişafı üçün mövcud reallıqlar və dünya təcrübəsi nəzərə alınmaqla, tərbiyənin milli konsepsiyası və inkişaf strategiyası hazırlanmalıdır. Gənc nəslin vətənpərvər ruhda tərbiyəsi təhsildə prioritet tələbdir və bu şəkildə də müəyyənləşdirilməlidir. Vətən müharibəsinin nəticələri nəzərə alınmaqla, təhsilin məzmununda müvafiq korrektə və düzəlişlər aparılmalı, Azərbaycanın ərazi bütövlüyünün təmin olunması və işğaldan azad olunan ərazilər haqqında yeni reallıqlar ümumi təhsilin məzmununa daxil edilməlidir. Təhsil Nazirliyi bu haqda öz mövqeyini cəmiyyətə açıqlayıb, dərsliklərdə müvafiq dəyişikliklər aparılmasına başlanılıb. Vətən müharibəsində Azərbaycanın qələbəsini təmin edən amillər təhlil olunmalı, bütün təhsil müəssisələrində "Qarabağ dərsləri", "Qarabağ şahinləri", "Milli qəhrəmanlar", "Qarabağ müharibəsi qəhrəmanları", "Şuşa əməliyyatı" adlı ustad dərsləri təşkil olunmalı, müharibə şəhidləri və qaziləri təhsilalanlara dərindən tanıdılmalıdır. Tərbiyə işinin sistemli təşkili, azərbaycançılıq ideologiyasının təbliği, Azərbaycan dilinə, ədəbiyyatına, tarixinə, mədəniyyətinə məhəbbət hissinin, milli-mənəvi dəyərlərə hörmət duyğularının aşılanması, Vətənə sədaqət - vətənçilik, vətəndaşlıq mövqeyinin formalaşdırılması, vətənpərvərlik tərbiyəsi bütün təhsil sisteminin, xüsusən ümumi təhsil və məktəbdənkənar təhsil müəssisələrinin qarşısında duran prioritet vəzifələrdən biri olmalıdır. Vətən müharibəsində qazanılan uğurlara dair elmi, elmi-kütləvi, bədii, publisistik əsərlər yaranacaqdır. Hesab edirik ki, "Qarabağ Azərbaycandır!" seriyasından bu tipli əsərlər çap olunmalı, dünyanın müxtəlif dillərinə tərcümə edilməli, tariximizin bu şərəfli səhifəsi uşaq və gənclərimizə çatdırılmalıdır. Bunlarla yanaşı, Qarabağ müharibəsi qəhrəmanları, qaziləri, şəhidləri, iştirakçıları haqqında ensiklopedik soraq kitabları hazırlanmalı, sənədli filmlər çəkilməli, həmin insanlar yetişməkdə olan uşaq və gənclərə yetərincə tanıdılmalıdır" (3).

Yeniyetməlik dövrü qəhrəmanlıq, vətənpərvərlik hissləri, inanc və baxışlar sisteminin formalaşması dövrüdür. Məktəbdə (ibtidai və orta məktəb) vətənpərvərlik tərbiyəsi məktəblilərin vətənpərvərlik anlayışlarının qavranılmasında artıq şüurlu münasibəti və yetkinliyi ilə seçilir. Məhz bu yaş mərhələsində aktiv vətəndaş mövqeyinin formalaşması baş verir. Yeniyetmələrdə düzgün dəyər yönümlü vətənpərvərlik tərbiyəsi üçün onların layihə fəaliyyətlərində iştirakı, Azərbaycan xüsusi təyinatlılarının nümayəndələri ilə problem-dəyər ünsiyyəti, vətənpərvərlik yarışları, intellektual yarışlar və oyunlar əhəmiyyətlidir.Orta məktəb şagirdləri üçün yeniyetmələrin vətənpərvərlik tərbiyəsinin qazilərdən mübahisələr, onlarla dəyirmi masalar, forumlar, döyüş əməliyyatlarının müzakirəsi kimi

formaları aktualdır. Məktəbdə əsas vəzifə hərbi-vətənpərvərlik tərbiyəsi,şagirdlərdə vətənpərvərlik şüurunun, vətənə sədaqət hissinin, Vətənin müdafiəsinin təmin edilməsi vəzifələrini yerinə yetirməyə hazırlığın inkişafına yönəlmiş hərbi-vətənpərvərlik tərbiyəsinin təşkili və əlaqələndirilməsidir. Bunun üçün zəruri olan bilik, bacarıq və vərdişlər, habelə hərbi-vətənpərvərlik tərbiyəsinin bütün potensial subyektləri ilə qarşılıqlı əlaqəsi təşkil edilir.

Məktəb şagirdlərində vətəndaş və hərbi-vətənpərvərlik səriştəsini inkişaf etdirmək və tərbiyə etmək ictimai həyatda, vətəndaş təşəbbüslərində, sosial əhəmiyyətli layihələrdə iştirak etmək təcrübəsi qazanmaq, fəal həyat mövqeyinə malik olmaqdır. Azərbaycan Respublikasına, ölkə xalqına, kiçik vətəninə məhəbbət haqqında dəyərli təsəvvürlər formalaşdırmaqdır.“Vətənə xidmət”, “hüquq sistemi və qanunun aliliyi”, “vətəndaş cəmiyyəti” kimi anlayışların məzmununun, “azadlıq və məsuliyyət” ”, “vicdan”, “vəzifə”, “ədalət” etibarı” və s. etik kateqoriyaları, “şərəf” dünyagörüşü anlayışlarının mənimsənilməsini inkişaf etdirməkdir. Vətənə, həmvətənlərə, ailəyə münasibət kontekstində vəzifə, şərəf və ləyaqət haqqında əxlaqi təsəvvürlər formalaşdırmaqdır.

Ulu öndər Heydər Əliyev Azərbaycanın ərazi bütövlüyünü təmin etmək üçün hərbi quruculuqla vətənpərvərlik tərbiyəsinin vəhdət təşkil etdiyini göstərərək demişdir:

“Şübhəsiz ki, əsas vəzifəmiz ordunu gücləndirməkdən, adamlarda vətənpərvərlik ruhunu daha da yüksəltməkdən, hər bir vətəndaşın, hər bir azərbaycanlının öz Vətənini müdafiə etməyi ən müqəddəs vəzifə saymasına nail olmaqdan, torpaqlarımızı azad etmək əzmindən ibarət olmalıdır” (Heydər Əliyev siyasəti: Tolerantlıq, 2015: 504).

Ona görə də Azərbaycan Respublikasında şagirdlərin hərbi-vətənpərvərlik tərbiyəsinin təşkili zamanı respublikamızın inkişafı və çiçəklənməsi üçün insanın hansısa dar ixtisası üzrə təhsil alması kifayət etmir, həm də insanın işləmək istəməsi və onun inkişafına hər cür töhfə verməsi tələb olunur. Bunun üçün uşaqlarda kiçik yaşlarından öz xalqının qəhrəmanlıq və tarixi keçmişinə, mədəniyyətinə məhəbbət, ana dili ilə, doğma təbiətinin gözəllikləri ilə fəxr hissi aşılanmalıdır. Bu problem müasir dövrdə çox aktual və əhəmiyyətlidir, çünki ölkəmizin gələcəyi gənc nəsildən asılıdır və müəllimlərin qarşısında hər bir uşaqda şəxsi inkişaf üçün sabit zəmin yaradan bütün zəruri keyfiyyətlərin formalaşdırılması kimi çətin vəzifə durur.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev respublikamızın dirçəlişinin hər bir insanın, xüsusilə gənc nəslin Vətənin taleyi üçün məsuliyyətindən, dəyər istiqamətlərindən və dünyagörüşü münasibətlərindən asılı olduğunu göstərir.

Möhtərəm Cənab Prezidentin 2019-cu il fevralın 1-də Azərbaycan Gəncləri Gününə həsr olunmuş respublika toplantısında bu amili xüsusi vurğulaması heç də təsadüfü deyil: “Bizim gənclərimiz milli ruhda, vətənpərvərlik ruhunda tərbiyə almalıdırlar. Əsrlər boyu bizim xalqımız başqa dövlətlərin, imperiyaların tərkibində yaşamışdır. Ancaq biz milli mənsubiyyətimizi, adət-ənənələrimizi qorumuşuq. Nəyə görə?! Ona görə ki, biz həmişə öz dəyərlərimizə bağlı olmuşuq və bugünkü gənclər daim bu məsələyə çox böyük diqqət yetirsinlər. Azərbaycan dəyərləri bizim üçün ən başlıca dəyərlərdir. Bizi bir xalq kimi, millət kimi qoruyan, əsrlər boyu assimilyasiyadan qoruyan məhz bizim dəyərlərimiz, ana dilimiz, mədəniyyətimiz, ədəbiyyatımız, incəsənətimiz olubdur. Azərbaycan gəncləri mütləq milli ruhda tərbiyə almalıdırlar ki, gələcəkdə dövlət maraqlarını, xalqımızın milli maraqlarını layiqincə qoruya bilsinlər... Sizin üçün ən başlıca vəzifə müstəqilliyi, milli maraqları qorumaq, Azərbaycanı yad təsirlərdən qorumaq və xalqımızın rahat həyatını təmin etməkdir. Mən şübhə etmirəm ki, siz buna hazırsınız. Azərbaycan gəncləri fəaldır, vətənpərvərdir, biliklidir, savadlıdır, sadiqdir” (5).

Hərbi-vətənpərvərlik tərbiyəsi təkcə qanuna tabe olan vətəndaşı deyil, həm də öz vətəndaşlıq borcunu şüurlu və fəal şəkildə yerinə yetirən şəxsiyyəti formalaşdırır, Azərbaycan Respublikasının

Dövlət Bayrağına və Gerbinə, qəhrəmanlıq və tarixi keçmişinə, mədəniyyətinə hörməti aşılamaqdan ibarətdir. Öz xalqının, doğma dilinə məhəbbəti, doğma təbiətinin gözəllikləri, öz ekoloji tərbiyəsi. Və nəhayət, milliyyətindən, siyasi və dini inancından asılı olmayaraq, respublikanın bütün vətəndaşlarının birliyinə töhfə verir, Azərbaycanın çiçəklənməsi naminə cəmiyyəti birləşdirir. Məkrli düşməni olan Azərbaycanda hərbi-vətənpərvərlik hisslərinin inkişaf etdirilməsinə ehtiyac vardır. Bu istiqamətdə orta məktəblərdə böyük işlər görülür. Orta məktəblərdə "Cəsurlar", "Şahin", "Sərhəd" kimi hərbi-idman oyunlarının keçirilməsi gəncləri həm Vətənin müdafiəsinə hazırlayır, həm də onlarda milli ruhu oyadır. Orada tələb olunan bütün fiziki və əqli hərəkətlər, çeviklik, cəldlik iştirakçılara müsbət təsir göstərir. Bu cür oyunların nəticəsi çox gözəl olur.

Məktəblərdə hərbi-vətənpərvərlik şüurunun formalaşması üçün həmin məktəbin məzunları ilə, hərbi xidmətini başa vurub qayıtmış, hərbi xidmətdə fərqlənmiş gənclərlə görüşlərin keçirilməsi də bu yöndə uğurlu addım olardı. Ekspertlər hesab edirlər ki qazilərin vaxtaşırı məktəblərə çağırılaraq gənclərlə görüşünün təşkil olunması bu sahədə müsbət nəticələrin alınmasına yardımçı ola bilər. Təhsil Nazirliyi, Müdafiə Nazirliyi, Dövlət Sərhəd Xidməti, Daxili Qoşunlar, Könüllü Hərbi Vətənpərvərlik Texniki İdman Cəmiyyəti və başqa təşkilatlarla birgə məktəblilər arasında "Cəsurlar", "Şahin", "Sərhəd" kimi hərbi-idman oyunları keçirir. Çox gözəl nəticələr var. Gənc nəslin milli mənlik şüurunun inkişaf etdirilməsi və onlarda vətənpərvərlik hisslərinin tərbiyəsi istiqamətində respublikamızın hər yerində lazımi işlər aparılır. Uşaqlarla vətəni qorumaq və sevməklə bağlı müxtəlif mövzularda söhbətlər edilir.

Hərbi-vətənpərvərlik hissinin yaradılmasında əhəmiyyətli rol oynayan hərbi idman oyunlarının keçirilməsi də təqdirəlayiqdir. Məktəbli uşaqların əsgər forması geyinərək yarışda iştirak etməsi, onların bir anlıq özlərini əsgər kimi hiss etməsinə şərait yaradır. Belə tədbirlər gənc nəslin hərbi-vətənpərvərlik ruhunda böyüməsinə öz müsbət təsirini göstərir.

Gənclərin hərbi-vətənpərvərlik tərbiyəsi ilə bağlı işlərin forma və üsullarının müxtəlif və rəngarəng olması da əhəmiyyətli rol oynayır. Azərbaycan ordusunun yaradılması günü kimi bayram tədbirlərinə hazırlıq və təntənəli surətdə qeyd edilməsi, hərbi hissələrə, döyüş yerlərinə, qəhrəmanların abidələrinə ekskursiyaların təşkil olunması, Qarabağ müharibəsinin veteranları, qaziləri ilə görüşlər keçirilməsi gənclərin yaddaşında dərin iz buraxır.

Hərbi-vətənpərvərlik mövzularında görüşlər, söhbətlər, ədəbi-bədii gecələr, müzakirələr keçirmək, şəkilli albomlar, fotosərgilər, fotoalbomlar təşkil etmək və s. tədbirlər vətənpərvərlik tərbiyəsində ən təsirli formalardır. Bunlar həyata keçirilən zaman hər bir gənc vətən qarşısında öz məsuliyyətini başa düşür, vətəni qorumağa, onu sevməyə bütün varlığı ilə hazır olur. Böyüklərə hörmət, tələbkarlıq prinsipinə əməl etmək, obyektiv olmaq, ləyaqət və humanizm kimi əxlaqi keyfiyyətləri uca tutmaq da gənclərin hərbi-vətənpərvərlik tərbiyəsinə çox güclü təsir göstərir. İstənilən halda vətəndaşlığı olan hər kəs Azərbaycanın dövlət maraqlarının müdafiə olunması naminə səylərini birləşdirməlidirlər. Belə olan təqdirdə, regionda və dünyada siyasi və dini zəmində baş verən qarşıdurmalardan zərərsiz çıxmaq mümkün olacaq. Hər bir vətəndaş Azərbaycanın gələcəyi üçün ayıq olmalıdır" (6).

Hərbi-vətənpərvərlik və vətəndaşlıq şagirdlərin mənəvi inkişafında böyük əhəmiyyət kəsb edir. Həmin dəyərlər şagirdlərin dünyagörüşünün və doğma ölkəsinə, başqa xalqlara münasibətinin tərkib elementləri kimi çıxış edir. Yalnız hərbi-vətənpərvərlik hisslərinin yüksəldilməsi əsasında vətənə məhəbbət güclənir, onun qüdrətinə və müstəqilliyinə, maddi-mənəvi dəyərlərin qorunub saxlanmasına məsuliyyət hissi, şəxsiyyətin nəcibliyi və ləyaqəti inkişaf edir.

Hərbi-vətənpərvərlik tərbiyəsi müasir təhsil müəssisəsinin təməl vəzifələrindən biridir. Azərbaycan cəmiyyətinin sosial, ədalətli, demokratik, sivil, qüdrətli, güclü dövlətə doğru irəliləməsi gənc nəslin hərbi-vətənpərvərlik tərbiyəsindən asılıdır. Məktəblərdə və ailələrdə hərbi-vətənpərvərlik tərbiyəsinin məzmunu müəllimlərin, pedaqoqların və valideynlərin vətənpərvərlik tərbiyəsi, millətlərarası ünsiyyət mədəniyyətinin formalaşdırılması, hüquq mədəniyyəti, zorakılıqdan uzaq ruhda tərbiyəsi işlərinin vəhdətini tələb edir. Gənc nəslin hərbi-vətənpərvərlik tərbiyəsi ruhunda inkişafında uşaq, yeniyetmə və gənclərin uşaq ictimai birliklərinin və təşkilatlarının fəaliyyətində iştirakı mühüm yer tutur (Məmmədov, 2004: 254-255).

Əsl hərbi-vətənpərvərlik təbiətcə humanist xarakter daşıyır və digər xalqlara və ölkələrə, onların milli adət və ənənələrinə, müstəqilliklərinə hörməti özündə ehtiva edir və millətlərarası münasibətlər mədəniyyəti ilə qırılmaz şəkildə bağlıdır. Bu münasibətlər formalaşarsa, şəxsiyyətin mənəvi inkişafında böyük əhəmiyyət kəsb edir və müxtəlif xalqlar və ölkələr arasında mehriban və dostluq münasibətlərinin qorunub saxlanmasına, hər bir insanın şüurunda ümumbəşəri dəyərlərin böyük əhəmiyyətinin dərk edilməsinə töhfə verir. Bu mənada hərbi-vətənpərvərlik və millətlərarası münasibətlər mədəniyyəti bir-biri ilə sıx bağlıdır.

Hərbi-vətənpərvərlik və beynəlmiləlçilik tərbiyəsində humanitar və təbiətşünaslıq silsiləsi fənləri mühüm rol oynayır. Bunlar ilk növbədə təlim prosesində, tədris prosesinin məzmununun seçilməsində əldə olunan nailiyyətlərdir. Doğma diyarın, xüsusilə qədim Şuşanın təbiətini, onun tarixi keçmişini öyrənmək uşaqda emosional olaraq yaşayır, Vətənə məhəbbət hissini gücləndirir və inkişaf etdirir.

Millətlərarası ünsiyyət mədəniyyətinin formalaşmasına xarici dillərin öyrənilməsi, öyrənilən dilin ölkələrinin tarixini, mədəniyyətini, bu ölkələrin xalqlarının adət-ənənələrini üzə çıxarmaqda kömək edir.

Vətənpərvərlik və vətəndaşlıq "ümumbəşəri dəyərlər" kimi anlayışla sıx bağlıdır. Biz elə bir qəddar əsrdə yaşayırıq ki, elmin, texnikanın və insan təfəkkürünün bu qədər yüksək inkişaf səviyyəsinə baxmayaraq, qəddar, barbar, ən əsası isə milyonlarla insanın həyatına son qoyan müharibə və münaqişələrin davam etdiyi, qadınların və uşaqların öldüyünü görürük.

Beləliklə, hərbi-vətəndaş-vətənpərvərlik tərbiyəsi hərtərəfli inkişaf etmiş ahəngdar şəxsiyyətin formalaşması prosesində çox vacib və əhəmiyyətli komponentdir. Çünki insanda əxlaqi ideallar, Vətənə məhəbbət hissi tərbiyəsi formalaşmadan təkcə öz həyatı üçün deyil, başqa insanların, xalqın taleyi üçün də məsuliyyət daşımadan dövlətin hərtərəfli inkişafı mümkün deyildir.

Vətənpərvərliyin və vətəndaşlığın mahiyyətini başa düşmək üçün nəzərə almaq lazımdır ki, bu keyfiyyətlərin tarixi genezisi (yunan dilindən genesis – mənşəli) ayrı-ayrı dövlətlərin öz müstəqillikləri və milli müstəqillikləri uğrunda apardıqları mübarizədə formalaşması və möhkəmlənməsi ilə bağlıdır. Bu mənada vətənpərvərlik, vətəndaşlıq insanlarda əsrlər, minilliklər boyu formalaşmış dərin hisslərdir.Vətəndaşlıq - vəzifə, ləyaqət, məsuliyyət, ictimai təcrübə və fəaliyyət, Azərbaycan cəmiyyətinin və vətəndaşının məqsədləri üçün ideyalar sistemi vasitəsilə milli özünüdərkin əsaslarının formalaşdırılması, onlara nail olmaq vasitələri; bir şəxs kimi özünə, ailəsinə, başqalarına, Vətənə, planetə münasibətdə hüquq və vəzifələrin həyata keçirilməsi yollarını mənimsəmək, Azərbaycan Respublikasının Konstitusiyasının qanunlarına riayət edilməsi, hüquqi mədəniyyətin, sosial həyat quruculuğunun əsaslarına yiyələnmək; Azərbaycanın inkişaf modelinin prioritetləri haqqında məlumatlılıq (sosial yönümlülük, iqtisadiyyatın çox struktur xarakteri - dövlət və özəl mülkiyyət formaları); dövlət sosial minimum standartlarının rolunu başa düşməkdir (Əliyev, 2001).

Beləliklə, hərbi-vətənpərvərlik xalqına, qonşusuna, özünə, tarixi keçmişinə, dilinə, mədəniyyətinə sevgi və hörmət kimi müəyyən edilə bilər. Azərbaycanlı etnik qrupuna mənsub olmaqdan qürur

duyur. İdentifikasiya insanın özünü cəmiyyətlə, onun inkişaf məqsədləri və cəmiyyətdəki yeri ilə əlaqələndirməsidir. Dövlətin suverenliyinin, daxili dəyərinin və milli maraqlarının tanınması və dərk edilməsidir.

Hərbi-vətənpərvərlik Vətənə məhəbbət hissidir, onun çiçəklənməsi və düşmənlərdən qorunması üçün fəal fəaliyyətdə ifadə olunur. Bu tərif ümumi mənada vətənpərvərlik ideologiyasının mahiyyətini ehtiva edir. Konkret olaraq vətənpərvərliyin istiqamətini onun ideoloji əsasları müəyyən edir.

Azərbaycan Respublikasında hərbi-vətənpərvərliyin ideoloji əsasları aşağıdakılarla müəyyən edilir:

Azərbaycan Respublikasının vahid və ayrılmaz ərazisinin öz xalqı, qorunub saxlanılması, inkişafı və qorunmasına layiq tarixi və mədəni dəyərləri; demokratik sosial hüquqi dövlətin qurulmasına və təkmilləşdirilməsinə zəmanət verən Azərbaycan Respublikası Konstitusiyasının olması; əsl xalq ənənələrini ifadə edən, milli tarixi köklərə malik olan və Vətənimizin müasir və gələcək inkişafına uyğun gələn Azərbaycan Respublikasının dövlət rəmzlərinin olması; cəmiyyətin etnik və ideoloji müxtəlifliyindən asılı olmayaraq xalqın birliyi; Azərbaycan Respublikasının ümumbəşəri dəyərlərə sadiqliyi və özünü dünya birliyinin tam hüquqlu subyekti kimi dərk etməsi.

Qeyri-bərabər sosial inkişaf və dünyanın demək olar ki, bütün dövlətlərində milli silahlı qüvvələrin mövcudluğu silahlı münaqişələrin mümkünlüyünü istisna etmir. Bu ilkin şərtlər Azərbaycan Respublikasının hərbi vətənpərvərliyini onun demokratik sosial-hüquqi dövlətini və digər dövlətlərlə əməkdaşlığı yaxşılaşdırmağa və qorumağa yönəldir.

Azərbaycan Respublikasında gənclərin hərbi-vətənpərvərlik tərbiyəsinin əsas məqsədləri gənclərə Vətən sevgisini aşılamaq, onlarda onun çiçəklənməsinə töhfə vermək və onu düşmənlərdən qorumaq istəyini formalaşdırmaqdır.

Hərbi-vətənpərvəlik tərbiyəsi Azərbaycan Respublikasının Silahlı Qüvvələrinə və Vətənin müdafiəçisinə, döyüşçüyə hörmət hissini artırır, gənclərdə Azərbaycan Respublikasını qorumaq üçün konstitusiya borcunu yerinə yetirmək üçün mənəvi, psixoloji və fiziki hazırlığı formalaşdırır.

## Nəticə

Azərbaycan Respublikasının ümumi təhsil sisteminin alt sistemi kimi şagirdlərin hərbi, vətəndaş-vətənpərvərlik tərbiyəsi həm təhsilin ümumi prinsiplərinə, həm də özünəməxsus amillərə əsaslanır. Bunlardan aşağıdakıları qeyd etmək olar:

- hərbi-vətənpərvərlik tərbiyəsində dövlət və ictimai prinsiplərin vəhdəti. Bu prinsiplər bütün təhsil müəssisələrində və Azərbaycan Respublikasının Silahlı Qüvvələrində gənclərlə tərbiyə işində xüsusilə aktualdır. Gənclərin hərbi-vətənpərvərlik tərbiyəsinin ictimai prinsipləri könüllülük, təşəbbüskarlıq, yaradıcılıq əsasında qurulur. Gənclərin vətənpərvərlik tərbiyəsində həm dövlət, həm də ictimai prinsiplərin mövcud olması və bir-biri ilə qarşılıqlı əlaqədə olması prinsipial əhəmiyyət kəsb edir;
- milli bərabərlik və birlik. Bu prinsip hazırda əsasdır. Azərbaycan unitar dövlətdir, lakin monoetnik deyildir. Milli ambisiyalar, konfliktlər və ya qarşıdurmalar bu və ya digər milli qrupda vətənpərvərlik elementlərini zərurətə çevirir. Hərbi-vətənpərvərlik tərbiyəsi millətlərarası münaqişələrin aradan qaldırılmasına kömək edir, cəmiyyəti möhkəmləndirir;
- tarixilik və obyektivlik. Şagirdlərin hərbi-vətənpərvərlik tərbiyəsinin demək olar ki, bütün kompleksində tarixi nümunə göstərmək, tarixi analogiya aparmaq, tarixi təcrübəni öyrənmək və təhlil etmək vacibdir;
- vətənpərvərlik və beynəlmiləlçiliyin vəhdəti. Vətəninin çiçəklənməsinin qayğısına qalan əsl vətənpərvər digər dövlətlər və xalqlar üçün də eyni haqqı tanımaya bilməz. Bu mənada Azərbaycan gənclərinin hərbi-vətənpərvərlik tərbiyəsi qaçılmaz olaraq beynəlxalq hüquqa uyğun olmalıdır;

Şəxsiyyətin hərbi-vətəndaş-vətənpərvərlik tərbiyəsi bir çox komponentlərdən və istiqamətlərdən ibarətdir ki, bu da bütün məqsəd və vəzifələri tam şəkildə həyata keçirməyə imkan verir. Hərbi-vətəndaş-vətənpərvərlik tərbiyəsinin əsas komponentləri bunlardır: Mədəni və tarixi, qəhrəmanlıq-

tarixi, ictimai-siyasi, mənəvi, hərbi-texniki və fiziki komponentlər.Bu komponentlər bir-biri ilə qarşılıqlı əlaqəlidir və şəxsiyyətin hərbi-vətəndaş-vətənpərvərlik tərbiyəsinin məzmun əsasını təşkil edir. Bu Konsepsiyaya uyğun olaraq, gənclərin hərbi-vətəndaş-vətənpərvərlik tərbiyəsi əsas istiqamət kimi ictimai-siyasi komponentdən, habelə mədəni-tarixi, qəhrəmanlıq-tarixi və mənəvi komponentlərdən ibarət olan ən aktual istiqamətdir.

Beləliklə, orta məktəblərdə Azərbaycan Respublikasında şagirdlərin hərbi-vətəndaş-vətənpərvərlik mədəniyyətinin formalaşdırılması üzrə maarifləndirmə işləri təşkil olunur. Hərbi, vətəndaşlıq və vətənpərvərlik tərbiyəsi məktəblərin, kolleclərin, texnikumların, universitetlərin, müxtəlif gənclər təşkilatlarının və uşaq və yeniyetmələrin istirahət yerlərinin məqsədyönlü və sistemli fəaliyyətidir. Bu zaman yüksək vətənpərvərlik şüuru, Vətənə sədaqət hissi, Vətənin mənafeyini qorumaq üçün vətəndaşlıq borcunu və konstitusiya öhdəliklərini yerinə yetirməyə hazır olan gənclər yetişir.

Hərbi-vətənpərvərlik və vətəndaşlıq bir-biri ilə əlaqəli mənəvi hisslər və davranış xüsusiyyətlərini: vətənə məhəbbəti, siyasi sistemə sədaqəti, öz xalqının adət-ənənələrinə riayət etməyi və onları inkişaf etdirməyi, doğma ölkənin tarixi abidələrinə və adət-ənənələrinə diqqətli münasibəti, doğma yerlərə məhəbbəti, Vətənin şərəf və ləyaqətini gücləndirmək istəyini, onu müdafiə etməyə hazırlığı və bacarığı, hərbi cəsarəti əhatə edir.

**Ədəbiyyat**

1. Azərbaycan Respublikasında 2022-ci ilin "Şuşa İli" elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. 05 yanvar. https://president.az/az/articles/view/55197 https://president.az/az/ articles/view/55197
2. Azərbaycan Respublikasının Təhsil Nazirliyi "Şuşa İli" ilə bağlı Bakı məktəblərində keçiriləcək tədbirləri müəyyənləşdirib. "Şuşa İli" ilə bağlı Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tədbirlər planı təsdiq edilib.https://azedu.az/az/news/54366-susa-ili-ile-bagli-baki-mekteblerinde-kecirilecek-tedbirler-mueyyenlesdirilib
3. Qarayeva, S. (2021). Gənc nəslin vətənpərvər ruhda tərbiyəsi prioritet tələbdir, 08.07. https://525.az/ news/171553-genc-neslin-vetenperver-ruhda-terbiyesi-prioritet-telebdir
4. Heydər Əliyev siyasəti: Tolerantlıq (çıxışlar, nitqlər, görüşlər, təbriklər). (2015). Bakı: "Elm və Təhsil". 504 səh.
5. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2019-cu il fevralın 1-də Azərbaycan Gəncləri Gününə həsr olunmuş respublika toplantısındakı çıxışı. https://president. az/az/articles/ view/31737
6. Vətənpərvərlik nədir? Olaylar. (2015). 27 may, 15 s. http://anl.az/down/meqale/olaylar/2015/ may/ 440132.htm
7. Məmmədov, E. (2004). Uşaqların hərbi-vətənpərvərlik tərbiyəsində dövlət atributlarından bayrağın rolu. Pedaqoji Universitetinin Xəbərləri, 254-255 s.
8. Əliyev, H. (2001). Milli-mənəvi və dini dəyərlərimiz haqqında. "Azərbaycan müəllimi" 16-22 avqust.

Göndərilib: 07.08.2022 Qəbul edilib: 03.10.2022

DOI: https://doi.org/10.36719/2706-6185/16/13-17

**Səadət Məmməd qızı Bayramova**
AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu
filologiya üzrə fəlsəfə doktoru
seadet19710214@gmail.com

# ƏZİZƏ ƏHMƏDOVANIN UŞAQ HEKAYƏLƏRİNİN ƏSƏRLƏRİNİN DİDİAKTİK ƏHƏMİYYƏTİ

**Xülasə**

Əzizə Əhmədovanın hekayələri, təmsilləri, uşaq ədəbiyyatı ilə bağlı apardığı təhlil yazıları mövzu və mündəricəsi, sərgilədiyi yaradıcı intelleksiyası ilə sırf etnik mədəniyyət kutsallıqlarının gələcək nəslə aşılanmasına hesablanır. Məlum olduğu kimi, uşaq fantaziyası və onun ucu-bucağı görünməyən maraq dairəsi bütün aspektləri ilə həyatı öyrənməyə, görüb-müşahidə etdiklərini dərkə yüklənir. Bunların isə bir bütöv və yüksək peşəkarlıqla bədii fakta çevrilməsi yaradıcıdan yüksək səriştə və bacarıq tələb edir.Uşaq yazıçısı olmağın çətinlikləri bu kontekstdə həm də uşaq qəlbinin mütəxəssisi olmağa bağlanır. Məqalədə Əzizə Əhmədovanın uşaqlar üçün yazdığı nəsr əsərləri araşdırılaraq geniş aspektdə təhlilə cəlb edilir.
***Açar sözlər:*** *Əzizə Əhmədova, nəsr, didaktika, uşaq ədəbiyyatı, hekayə*

**Saadat Mammad Bayramova**
ANAS Institute of Literature named after Nizami Ganjavi
Ph.D. in Philology
seadet19710214@gmail.com

## Children's stories of Aziza Ahmadova the didactic significance of his works

**Abstract**

Aziza Ahmadova's analysis of stories, representations, and children's literature is aimed at instilling ethnic cultural sanctities to the next generation with the content and content and her creative intellect. As is well known, children's fantasy and its infinite range of interests are charged with learning about life in all its aspects, understanding what they see and observe. Turning these into a whole and highly professional artistic fact requires high competence and skill from the creator. The challenges of being a children's writer, in this context, are also tied to being an expert on children's hearts. In the article, the prose works written by Aziza Ahmadova for children are analyzed in a broad aspect.
***Keywords:*** *Aziza Ahmadova, prose, didactics, children's literature, story*

## Giriş

İyirminci yüzillik ədəbiyyat tarixinə uşaq yazıçısı kimi adını yazmış Əzizə Əhmədovanın yaratdığı nəsr örnəkləri didaktik əhəmiyyəti ilə həmişə geniş oxucu kütləsinin marağına səbəb olmuşdur. Ümumiyyətlə, Azərbaycan uşaq ədəbiyyatının inkişafında iyirminci yüzillik ayrıca mərhələdir. Bu mərhələnin zənginliyi yaradıcı axtarışları, janr rəngarəngliyi və mətn mükəmməlliyi möhtəşəmlik qazanır. Poeziya, nəsr, dramaturgiya müstəvisində yüksək etnokulturoloji təfəkkür intelleksiyasına bağlanan poetik örnəklər zəngin məzmun qatları, uşaq dünyasını əks etdirmə spesifikası, didaktik mahiyyəti ilə müxtəlif təhlillərdə sistemli yanaşmalara şərait yaradır.

Əzizə Əhmədovanın müxtəlif zaman kəsiklərində çıxan "Xınalı qayalar" (1967), "Yaz qarı" (1970), "Bu ellərə vurulmuşam" (1970), "Onu çiçəklər sevdi" (1977), "Bir ürək sındırmışam"

(1980), "O günlərə baxıram" (1982) və s. kitabları bütünlükdə yaradıcı istedadını, bədii-estetik qayənin morfologiyasını, metamodel formulasını bir bütöv olaraq ortaya qoymaq gücündə görünür. Ümumiyyətlə, "uşaq ədəbiyyatı mənəvi-estetik və ideya-məfkurəvi tərbiyə məktəbinə çevrilmişdir. Bu ədəbiyyat yeniyetmələri əməksevər, namuslu, vətənsevər, milli və bəşəri olmaq ruhunda tərbiyə edir. Öz qaynaqlarını əsrlərin dərinliyindən alan Azərbaycan uşaq ədəbiyyatı təravətli, təsirli və uzun ömürlüdür. Şifahi xalq ədəbiyyatı xəzinəsinin inciləri – nağıllar, mahnılar, dastanlar, atalar sözləri, lətifələr və s. uşaq ədəbiyyatını xəlqilik və bədii sənətkarlıq baxımından zənginləşdirir. Məlumdur ki, uzun əsrlərdən bəri xalq öz folklorunda uşağa pedaqoji və bədii-estetik tərbiyə metodunun ideal nümunəsini yaratmışdır" (Namazov, 2007: 8). Ə.Əhmədovanın yaradıcılığının ana axarını bütün parametrlərdə məhz xalqın zəngin həyat təsəvvürləri, müəyyənləşmiş kutsal mədəniyyət klişeləri təşkil edir. Yüksək xəlqi təfəkkür intelleksiyasına bağlanan bu örnəklər funksional məzmun qatları ilə arxaik modelləşmə normativləri üzərindən sənətkarlıq baxımından bütövlük qazanır.

"Qorxmazın səhvi" (1957) ilə böyük ədəbiyyata gələn Ə.Əhmədova uşaq qəlbinin mütəxəssisi olaraq milli-mənəvi dəyərlərin təbliğini bütün yaradıcılığı boyu məram olaraq qarşısına qoymuş və yaratdığı hər bədii örnəklə nəyisə aşılamağı məqsədə çevirmişdir."Xınalı qayalar", "Arı", "Novruzgülü-yazgülü", "Qısa ömrü mərd yaşadı", "Onu çiçəklər sevdi", "Şehli güllər", "Duman", "Səyyar dovşan", "Yağış", "Yaz qarı", "Toplan və kölgəsi", "Heyvanların qış hekayəti", "Ayı meşədən küsdü", "Ağlayan çəpiş" və s. hekayələr uşaqların mənəvi dünyasına işıq tutmaq, bilgi vermək baxımından əvəzsizdi. Xalqın zəngin mədəniyyət təsəvvürlərinə bağlanan bu hekayə örnəkləri adından da göründüyü kimi mükəmməl faktura ilə səciyyəvilik qazanır. Burada ilin fəsilləri, təbiətin əsrarəngiz gözəllikləri, coğrafi landşaftın rəngarəngliklə əvəzsizlik sərgiləyən flora və faunası bir məram olaraq uşaqlara təlqin olunmaq məqsədi daşıyır. Görkəmli maarifçi H.Zərdabinin on doqquzuncu yüzillikdə söylədiyi "balalarımızın başa düşəcəyi əsərlər yaradaq" çağırışı bir tezis olaraq sonrakı dönəmlər üçün prinsip səviyyəsində əsas götürülmüşdür. "Bir bahar meşədə, kol dibində bitən bənövşə başını qaldırdı. Mavi gözlərini həyata açdı, sevinclə dedi:

-Ah, dünya nə gözəldir! Meşə nə gözəldir! Hər tərəf mavidir. Səmaya bax, o da mavidir! Yerə bax, o da mavidir! Ağaclar da mavidir! Yaşamaq nə qədər gözəldir!

Bayaqdan kol dibində qısılıb, nəfəsini belə çəkməyə qorxan Dovşan onun səsini eşidib, kəkələyə-kəkələyə dedi:

-Yaşamaq gözəldir deyirsən?! Əlbəttə, sənin üçün yaşamaq gözəldir. Nə qurd dalınca düşüb səni qovur, nə də tülkü. Özün də nə yemək dərdi çəkirsən, nə də qorxu" (Əhmədova, 1980: 120). Göründüyü kimi, mətn informasiyası və epizodun verdiyi təfsilat mükəmməllik örnəyi olaraq bir neçə istiqamətdə motivləşmə ilə diqqət önünə gəlir.

a) uşaq dünyasını əks etdirmə modelinin spesifik müəyyənliyi ilə;

b) mükəmməl nitq etiketlərindən yararlanma imkanlarının rəngarənglik aspektlərini sərgiləmək xüsusiyyəti ilə bütövlük qazanır;

c) didaktik məzmun qatının çatdırdığı informasiya əsrarəngizlikləri etnik müəyyənliyin lakanikliyinə bağlanır;

ç) dil, üslub mükəmməlliyi ilə yazıçı istedadının nələrlə faktlaşdığını aydınlaşdırır;

d) mühit və yaradıcı şəxsiyyət timsalında ciddi təsəvvür formalaşdırır və s.

Bütün bunlar bir bütöv olaraq yazıçı təsəvvürünə, etnik sistemin arxaik yaddaşdan gələn normativlərinə, əxlaq və mənəviyyat bütövlüyünə bağlanır. Bənövşə və dovşan timsalında canlandırma uşaq dünyasını əks etdirməyə, onun spesifiklik məqamlarında olanları bir bütöv olaraq faktlaşdırmağa köklənir (Azərbaycan klassik uşaq ədəbiyyatı antologiyası, 1998: 300).

Dünyanın gözəlliyi, təbiətin füsunkarlığı, baharın əsrarəngizlikləri timsalında sərgilənən bilginin çatdırma üsulları uşaq fantaziyasına, görüb müşahidə etdiklərinə əsaslanmaqla, həm də onun dərkinə bağlanır. Yazıçı bütünlükdə yüksək sənət intelleksiyasından çıxış etməklə nitq janrları ilə uşaq dünyasına son dərəcədə həssaslıq göstərməklə dünyanın gözəllikləri timsalında iki təbiət

varlığını obrazlaşdırır. Dovşan və bənövşə timsalında uşaq fantaziyası, onun özünəməxsusluq qatları yazıçı dərki və uğurlu ifadə forması ilə mahiyyəti ortaya qoyur. Flora (bitki aləmi) timsalında bənövşə bir zəriflik və fauna (heyvanlar aləmi) timsalında dovşan bir ehtiyatkarlıq və qorxaqlıq, zəiflik baxımından təxminən müəyyən kontekstlərdə eyni xətdə dayanır. Uşaq dərkində və marağında bunların özünəməxsus canlandırılması və ona qayğı anlamında rəhmlilik təsəvvürünün aşılanması vardır. "Cəmiyyət böyüməkdə olan nəslin timsalında öz ömrünü davam etdirir və həmin nəslin tərbiyəsi, əxlaqı, mənəviyyatı, davranış normaları, dünyagörüşü, əqidəsi, arzu və istəkləri daim onun diqqət mərkəzində durur. Həmin keyfiyyətlərin işıqlı, müsbət istiqamətə yönləndirilməsində uşaqlar üçün yaradılmış mənəvi sərvətdən-bədii əsərlərdən də mühüm vasitə kimi istifadə edilir.

Azyaşlılar və gənclər üçün yazılmış məzmunlu, dolğun, sağlam ruhlu əsərlər uşaqların mənəvi-estetik zövqünü oxşayır, fantaziya və xəyallarının hüdudlarını genişləndirir, əxlaqi-tərbiyəvi cəhətdən kamilləşməsinə, dünyaduyumunun, həyati idrak qabiliyyətinin inkişafına, vətənpərvər, nikbin, humanist və beynəlmiləlçi kimi yetişməsinə kömək edir, həyat və mübarizəsinin həqiqi yolunu onlara öyrədir" (Məmmədov, Babayev, Cavadov, 1992: 3). Ə.Əhmədovanın çeşidli mövzularda yazdığı "Nənəm və mən", "Bənövşə bəndə düşə", "Hər çəməndən bir çiçək", "Rəssam payız", "Şanapipik alçaqdan uçarsa", "Xəzri", "Xəzər Xəzərdən gəlir", "Bu kisəni hardan almısan", "Qaragöz", "Xəbərçi qara qarğa", "Ayını yer uddu", "Bir qış gecəsi", "Günəş gəldi meşəyə", "Lalə bəbəyində bir ev var", "Bahar gələndə" və s. hekayələri yazıçı istedadının zənginliyini, onun didaktik işarələnmə spektrlərini, ortaya qoyduğu əxlaqı, mənəviyyat və düşüncə zərifliyini bir bütöv olaraq əks etdirməyə bağlanır.

Əzizə Əhmədovanın rəngarəng mövzularda yazdığı əsərləri adlanmadan bütünlükdə məzmun xətlərinə, ifadə üsullarına qədər bu kanonik sistemin qorunuşuna bağlanır. Mövzu seçimi, onun çatdırılması spesifikası, dil janrları və s. sırf uşaq dünyasına enməni və oradan çıxış etməni bir zərurət olaraq qarşıya qoyur. Bədii örnəyin uğurluluğu bütün parametrlərdə buna bağlanır və bir prinsip olaraq əsas götürülməni gərəkli edir. Məsələn, suallarla dolu bir nümunəyə diqqət yetirək: "Görən Günəş yorulmur? Axı, o bircə saat da dincəlmir, həmişə yoldadır. Hardasa, kiməsə köməyə tələsir bu odlu kürə.

Günəşmi tələsir? Günəşmi gedir? Əlbəttə, yox! Yer kürəsidir gedən. Yer kürəsidir tələsən!

Günəş çəkildi, sanki ətrafa bir kədər çökdü. Quşlar yuvalarında gizləndilər, bu kədəri quşların susması bir qədər də hüznləşdirdi.

Günəş çəkildi, hava soyudu. Bayaqdan Günəşdən qorxan külək ətəklərini çəkə-çəkə gəldi və öz buz nəfəsini ağaclara toxundurdu. Uzun tellərini yerə sürtən söyüdlər əsdilər. Tellərini bir yerə cəm elədilər. Sanki anlamışdılar ki, külək onların kövrək tellərini yolub tökəcək. Duymuşdular ki, Günəş batandan sonra meydan küləyə qalır" (Əhmədova, 1990: 313). Burada isə müəllif bir başqa bilgini Günəşin hərəkətliliyi kontekstində mətnə gətirir və onun funksiyasını, istilik, işıq timsalında ortaya qoyduğu paradiqmanı diqqət önünə gətirməklə təfsilata varır. İşıq və qaranlıq, gecə və gündüz, isti və soyuq timsalında özünü göstərən sıralanma uşaqlar üçün bir qavram hadisəsi olmaqla müxtəlif yanaşmalara, maraqlara yol açır. V.V.Vinoqradov vurğulayır ki, "ümumiyyətlə, söhbət fərdi söz yaradıcılığından gedəndə üslub məsələsi fövqəladə dərəcədə kəskin şəkildə meydana çıxır. Adətən, belə deyirlər ki, üslub elə insanın özüdür, o, təkrarolunmaz fərdiyyətdir" (Əhmədova, 1978: 80).

Ə.Əhmədovanın üslubu onun fərdiyyətini, həyat hadisələrini dərkini və ona yanaşma üsullarını bir bütöv olaraq ortaya qoymaq və qoya bilmək gücü ilə səciyyələnir. Yuxarıda "Lövhə" hekayəsindən verdiyimiz nümunə didaktik məzmunu, informasiya yükü və mətn fenomenliyi, janr paradiqması ilə orjinal bir canlandırmanı, sənət nümunəsi olmanı diqqət önünə gətirir. Bədii nümunənin janr korpusu qısa və lakonik, informasiya yükü uşaqlara Günəş və Yer kürəsi timsalında maraqlı bir bilginin çatdırılmasına bağlanır. Digər kontekstdə işığın, nurun nə qədər funksional çəkiyə malik olduğunu özünəməxsusluqla aşılamağa köklənir.

Mətn informasiyası, yazıçı qayəsi, bədii-estetik prinsipin ortaya qoyduğu mükəmməllik bütünlükdə yaradıcı istedadına bağlanır. Uşaq yazıçısı olmada isə bu məsuliyyəti daha da artırır. Mövzu seçimindən onun çatdırılmasına qədər nə varsa hamısı sözün məna yaddaşına, mətn fenomenliyinə, bədii-estetik formulanın unikallığına bağlanır. Ə.Əhmədova mətn və mühit, mətn və subyekt, mətn və mətn timsalında uşaq təsəvvüründə olanlardan və onların çeşidli maraqlarından çıxış etməklə hər bir hekayə və təmsil örnəyində maraqlı bir bilgi, didaktik qayə diqqət önünə gəlir. "Ayı meşədən küsdü", "Heyvanların qış hekayəsi", "Lovğa ördək balası", "Səyyar dovşan", "Tülkünün kələyi baş tutmadı", "Göl əfsanəsi", "Xəbərçi qara qarğa", "Ağlayan çəpiş" və s. hər birisi uşaq marağında olanları və onun didaktik mahiyyətinə dayananları əks etdirmək məqsədi daşıyır.

Bütün bunlar yazıçı istedadı və mövzunu dərk səviyyəsində ciddi mükəmməlliyə yüklənməklə, həm də bilgi verməyə, onların canlılara, təbiət varlıqlarına həssaslığının oyanışı və təlqini təsəvvürünə hesablanması ilə səciyyəvilik qazanır. "Hər bir xalqın gələcək taleyinin müəyyənləşməsində böyüməkdə olan nəslin necə və hansı şəkildə tərbiyə olunmasının müstəsna dərəcədə əhəmiyyəti vardır. Xalqın gələcəyi olan uşaqların mənəvi, əxlaqi, etik və estetik cəhətdən düzgün tərbiyəsi də həmin əhatəli tərbiyə sisteminin mühüm tərkib hissəsidir. Kiçikyaşlı uşaqların və gənc nəslin bu istiqamətdəki tərbiyəsində bir sıra dəyərli üsul və vasitələr vardır. Bu üsul və vasitələr içərisində bədii ədəbiyyatın, xüsusilə onun mühüm bir qolu olan uşaq ədəbiyyatının da ciddi və müstəsna rolunu qeyd etmək lazımdır" (Məmmədova, 2014: 4).

Ə.Əhmədova da bütün uşaqlar üçün yazdığı əsərlərlə eyni düşüncəyə, uşaqların və gənclərin milli-mənəvi dəyərlər kontekstində tərbiyəsinə görə təsəvvüründən gələn münasibətlər kutsallığına həssaslıq göstərməklə möhtəşəm bir ədəbiyyat xəzinəsi yaratmışdır. Məhz bütün bu zənginlikdən çıxış etməklə Z.Xəlil və F.Əsgərli vurğulayır ki, "Əzizə Əhmədova müasir uşaq nəsrinin tanınmış nümayəndələrindən biridir" (Xəlil, Əsgərli, 2011: 362). Görkəmli sənətkarın səhnə əsərləri, tərcümələri, eləcə də uşaq ədəbiyyatının aktual problemləri ilə bağlı təhlil yazıları zəngin istedadının imkanlılıq göstəriciləridir. Xalq yazıçısı M.Dilbazi vurğulayırdı ki, "onun yazıçı üslubu heç kəsə bənzəmir". Mövzu və mündəricəsi, janr örtüyü ilə kifayət qədər əhatəli olan sənətkar tərcümə sahəsində də oxuculara öz töhfələrini vermişdir. A.Kuprinin "Gözəl həkim", A.A.Milinin "Vinni-Pux və hamı-hamı-hamı", V.Hayfın "Balaca Muk", A.Lindqrenin "Balaca və damda yaşayan Karlson" və s. tərcümələri Azərbaycan oxucularını dünya ədəbiyyatının örnəkləri ilə tanış etmək məqsədi daşıyır.

Canlı həyat tabloları, yüksək təfəkkür intelleksiyası, yazı texnologiyası və ədibin mövzunu çatdırma üsulları Ə.Əhmədovda bütün yaradıcılığı boyu bir prinsip olaraq özünü qabarıq şəkildə göstərir. Bunlar, heç şübhəsiz, ədibin yaradıcı istedadı, müəllif üslubuna sədaqətindən irəli gələn məsələlərdir. Yazıçının hekayə, povest və təmsillərində nəzərə çarpan həyat lövhələri bütün kontekstlərdə informasiya bolluğuna, fikrin ifadə üsullarının məzmun səviyyəsində didaktik yükünə köklənir. Bu isə özlüyündə bədii örnəyin sənət hadisəsi olmasına, uğurluluğuna gətirib çıxarır. Məlum olduğu kimi, "Sözün ifadəliliyi yalnız onun ifadə etdiyi mənadan yox, yəni onun leksik mənasından yox, həm də onun stilistik siqlətindən, eləcə də sözün akustik çalarlarından tutmuş assosiativ-emosional çalarlarına qədər başqa sözlərlə müxtəlif əlaqələrindən də asılıdır" (Məmmədov, Babayev, Cavadov, 1998: 61).

## Nəticə

Uşaq ədəbiyyatında bu tendensiya daha aparıcılıqla, həm də folklordan gələn elementlərin zənginlik fakturası ilə səciyyələnir. Çünki bədii düşüncə qavramın və ifadənin elə qanadlı tərəfidir ki, bir cizgi və epizodla böyük-böyük hadisə və əhvalatları çatdırmaq olur. Azərbaycan uşaq ədəbiyyatının gəldiyi yol ədəbiyyatın həm şifahi, həm də yazılı qolunda bunları bir məram olaraq

qarşısına qoyur. Ə.Əhmədova da müxtəlif mövzularda yazdığı uşaq ədəbiyyatı örnəklərində bunları bir prinsip kimi əsas götürür.

Əzizə Əhmədovanın uşaqlar üçün yaratdığı bədii örnəklər polifinik məzmunu və etnoenerjini ifadənin yüksək funksionallığı ilə səciyyəvilik qazanır. Ayrı-ayrı hekayə, təmsil, povestlərin ehtiva etdiyi müəyyənlik sənət kredosu olaraq mətn fenomenliyinə, yaradıcı istedadının möhtəşəmliyinə, mövzu və məzmun zənginliyinin təlqin etdiyi didaktik fakturaya bağlanır. Bütün bunlar fövqəlzamanlıq səviyyəsində tarixi-mədəni prosesin ümumi axarını faktlaşdırmaqla onun məzmun qatında olanların spesifikasını aydınlaşdırır və daha geniş kontekstdə tipoloji yanaşmaları zəruriləşdirir.

**Ədəbiyyat**


1. Namazov, Q. (2007). Azərbaycan uşaq ədəbiyyatı. Bakı: Bakı Univeriteti, 444 s.
2. Əhmədova, Ə. (1980). Bir ürək sındırmışam. Bakı: Gənclik, 170 s.
3. Azərbaycan klassik uşaq ədəbiyyatı antologiyası. (1998). Bakı: Elm, 300 s.
4. Məmmədov, M., Babayev, Y., Cavadov, T. (1992). Pedaqoji mühit və uşaq ədəbiyyatı. Bakı: Maarif, 288 s.
5. Əhmədova, Ə. (1990). Bir məhəbbət burulğanı. Bakı: Yazıçı, 320 s.
6. Əhmədova, Ə. (1978). Bu ellərə vurulmuşam. Bakı: Yazıçı, 80 s.
7. Məmmədova, Ş. (2014).Uşaq ədəbiyyatı (Mirvarid Dilbazinin uşaq yaradıcılığı). Bakı: ADPU, 197 s.
8. Xəlil, Z., Əsgərli, F. (2011). Uşaq ədəbiyyatı. Bakı: ADPU, 498 s.
9. Məmmədov, M., Babayev, Y., Cavadov, T. (1998). İki əsrin maarif işığında. Azərbaycan klassik uşaq ədəbiyyatıantologiyası. Bakı: Elm, 310 s.


Göndərilib: 19.08.2022 Qəbul edilib: 15.10.2022

DOI: https://doi.org/10.36719/2706-6185/16/18-24

**Gözəl Sabit qızı Quliyeva**
İstanbul Universiteti
doktorant
gozel.quliyeva93@mail.ru

# OĞUZ ELİNDƏ QADININ DƏYƏRİ
# ("KİTABİ-DƏDƏ QORQUD" DASTANI ƏSASINDA)

**Xülasə**

"Kitabi-Dədə Qorqud" gender münasibətlərini özündə bədii şəkildə əks etdirən abidədir. Dastanda qadın ana obrazında, qəhrəmanın ömür-gün yoldaşı kimi, müxtəlif ritualların iştirakçısı olaraq təqdim olunur. Müqəddimədə qadınlar barədə deyilmiş fikirlərə nəzər salmaqla Oğuz elində qadına verilən dəyəri aydınlaşdırmış, qadının cəmiyyətdəki vəzifəsi və mövqeyi barədə deyilən faktların hətta bu günün özündə belə öz qüvvəsini saxladığını görmüş olarıq. Bundan başqa Oğuz ailəsində ər-arvad münasibəti də önəmli yer tutan, mühüm məsələlərdən biridir. Bu cür münasibətlərdə qadın qəhrəmanların göstərdiyi fədakarlıq ön planda verilməkdədir. Dastanda qadına olan hörmət, qadının vəzifələri aydın şəkildə verilmişdir. Dilindən, dinindən asılı olmadan igid, cəsur qadınlar yüksək qiymətləndirilmişdir.
***Açar sözlər:*** *gender, dastan, Oğuz, tolerantlıq, Dədə Qorqud*

**Gozal Sabit Guliyeva**
Istanbul University
PhD student
gozel.quliyeva93@mail.ru

## Attitude towards women in Oghuz province (Based on the epic "Kitabi-Dada Gorgud")

**Abstract**

"Kitabi-Dade Gorgud" is a monument that artistically reflects gender relations. In the epic, a woman is presented as a mother, as a lifelong companion of the hero, as a participant in various rituals. By looking at the ideas about women in the introduction, we have clarified the value given to women in Oguz province, and we can see that the facts about the role and position of women in society retain their force even today. In addition, husband-wife relationship is one of the important issues in the Oguz family. In such relationships, the sacrifice shown by the female heroes is given priority. In the saga, the respect for women and the duties of women are clearly given. Brave and courageous women, regardless of their language and religion, were highly valued.
***Keywords:*** *gender, saga, Oguz, tolerance, Deda Gorgud*

## Giriş

Multikultural dəyərlərin nümayişi, qadına verilən dəyər, türk ailəsində qadınların önəmi baxımından keçmişi öz səhifələrində yaşadan və bunu gələcək nəsillərə daşıyan "Kitabi-Dədə Qorqud" dastanı bizə və gələcək nəsillərə ən bariz nümunədir.

Ulu öndər Heydər Əliyev ana abidəmiz olan dastanı yüksək qiymətləndirmiş və öz nitqində bildirmişdir: "Azərbaycan xalqının, bütün türkdilli xalqların böyük tarixi abidəsi olan "Kitabi-Dədə Qorqud" 1300 ildir ki, yaşayır. Əgər 1300 ildən də öncə "Kitabi-Dədə Qorqud" dastanlarının yaranması üçün xalqlarımızın nə qədər səylər göstərdiyini və nəhayət, bu tarixi abidəni yaratdığını

nəzərə alsaq, onda təsəvvür edə bilərik ki, bizim xalqlarımızın nə qədər qədim tarixi, dərin kökləri və nə qədər zəngin mədəniyyəti vardır" (Heydər Əliyevin nitqi, "Azərbaycan" qəzeti, 2000).

"Kitabi-Dədə Qorqud"da gender bərabərliyi, dini tolerantlıq, ailə münasibətləri, müxtəlif xalqların birgə əmin-amanlıq içində yaşaması kimi xüsusiyyətlər eyni zamanda dastanın hansı multikultural dəyərlərə sahib olmasından xəbər verir.

Azərbaycan dastanlarındakı qadın obrazları, xüsusilə də "Kitabi-Dədə Qorqud" dastanı gender münasibətlərini, özündə bədii şəkildə əks etdirir. Dastanda qadın ana obrazında, qəhrəmanın ömür-gün yoldaşı kimi, müxtəlif ritualların iştirakçısı olaraq təqdim olunur. Müqəddimədə qadınlar barədə deyilmiş fikirlərə nəzər salmaqla Oğuz elində qadına verilən dəyər barədə məlumat almış olarıq. Qadının cəmiyyətdəki rolu, mövqeyi və ona münasibət, adətən, həmin xalqın etnopsixologiyası ilə bağlıdır. "Kitabi-Dədə Qorqud"da qadının cəmiyyətdəki vəzifəsi və mövqeyi barədə deyilən faktlar, hətta bu günün özündə belə öz qüvvəsini saxlayır. Odur ki, "Kitabi-Dədə Qorqud"un müqəddiməsində qadınla bağlı əks olunan fikirləri təkcə sözügedən dastanın məlumatı kimi yox, bütövlükdə türk etnomədəniyyətinin qadına münasibəti kimi anlamaq məqsədəuyğundur. Müqəddimədə təsvir olunan qadın tiplərinə nəzər yetirək.

Müqəddimədə deyilir: "Ozan aydır Qarılar dört dürlüdür birisi solduran soydır, birisi toldıran toydır, birisi evin dayağıdır. Birisi necə söylərsən bayağıdır" ("Kitabi-Dədə Qorqud", 1988: 33).

Müqəddimədə Ozan qruplar üzrə qadınların xüsusiyyətlərini sadalayır və Oğuz elinin həmin qadınlarla bağlı münasibətlərini diqqətə çatdırır. Müqəddimədən aydın olur ki, Oğuz elində evin dayağı xanımlar aşağıdakı xüsusiyyətlərə malikdirlər.

"Ozan, evin dayağı oldur ki, yazıdan-yabandan evə bir qonuq gəlsə, ər adam evdə olmasa, ol anı yedirər-içirər, ağırlar-əzizlər, göndərər. Ol Ayişə, Fatimə soyıdır, xanım. Ocağına buncılayın övrət gəlsün" ("Kitabi-Dədə Qorqud", 1988: 33).

Bu fikirlərdən aydın olur ki, Oğuz cəmiyyətində ərlərinə sədaqətli olan, ərləri evdə olmadıqda belə gələn qonağı Oğuz normalarına uyğun şəkildə qarşılayaraq yedirdib-içirtmək bacarığına malik olan qadınlar ideal qadınlardır. Odur ki, İslam dinini yeni qəbul etmiş Oğuz elində belə qadınlar Ayişə, Fatimə kimi mübarək xanımlarla müqayisə olunur. Və ağzı dualı ozan bütün Oğuza bu keyfiyyətlərə sahib olan qadın arzulayır.

Sonra dastanda solduran soy qadınlar üçün xarakterik olan xüsusiyyətlər diqqətə çatdırılır:

"Gəldik, ol kim, solduran soydır, sabadanca yerindən uru turar, əlin-yüzin yumadan doquz bazlammac ilən bir küvlək yoğurd gəvəzlər, toyunca tıqabasa yer, əlin böğrinə urar, aydır Bu evi xarab olası! Ərə varalıdan bərü daxi qarnım toymadı, yüzüm gülmədi. Ayağım başmaq, yüzüm yaşmaq görmədi! Deyər Nolaydı, bu öləydi, birinə dəxi vareydim. Umarımdan yaxşı-uyar olaydi, - deyər. Anun kibinin, xanım, bəbəkləri bitməsün, ocağına buncılayın övrət gəlməsün" ("Kitabi-Dədə Qorqud", 1988: 33).

Mətndən aydın olur ki, solduran soy qadınlar ər evindən, yurd-yuvasından narazı, yeyib-içəndən sonra deyinən, öz güzəranından şikayət edən, hətta yenidən ərə getmək istəyən qadınlardır. Odur ki, bu xüsusiyyətlərə malik olan qadınların təsvirindən sonra ozanın belə qadınlara qarğışı, Oğuza alqışı yer alır.

Eposun boylarına nəzər saldıqda orada öz yurd-yuvalarına bağlı, elinə sədaqətli və ərlərinə sadiq, öz qəhrəmanlıqlarına görə heç də ərlərindən geri qalmayan qadınlarla qarşılaşırıq. Ola bilər ki, Oğuz elinin belə yüksək mənəvi-əxlaqi keyfiyyətə sahib olan qadınlarının olması birbaşa olaraq mənfi keyfiyyətli qadınlardan uzaq durmaq ideyasından ortaya çıxmışdır.

Müqəddimədə toldıran toy qadınlar üçün xarakterik xüsusiyyətlər də əks olunmuşdur.

"Gəldik, ol kim, toldıran toydır, dəpidincə yerindən uru turdı, əlin-yüzin yumadan obanın ol ucından bu ucına, bu ucından ol ucına çarpışdırdı. Quv quvladı, din dinlədi, öylədəncə gəzdi. Öylədən sonra evinə gəldi. Gördi kim, oğrı köpək, yekə dana evini bir-birinə qatmış-tavuq komasına sığır damına dönmiş. Qonşularına çağırar ki, Yetər! Zəlihə! Zübeydə! Ürüveydə - can,

qız-can! Paşa! Ayna Mələk! Qutlu Mələk! Ölməgə-itməgə getməmişdim, yatacaq yerim genə bu xarab olasıydı. Noleydı bənim evimə bir ləhzə baqaydınız! Qonşu haqqı - Tanrı haqqı deyü söylər. Bunus kibinin, xanım, bəbəkləri yetməsün. Ocağısa bunus kibi övrət gəlməsün" ("Kitabi-Dədə Qorqud", 1988: 33).

Buradan aydın olur ki, oturaq mədəniyyətə malik olan oğuzlar üçün ev mədəniyyəti mövcud olmuş və bu mədəniyyətin əsas qoruyucusu kimi isə qadın aparıcı rol oynamışdır. Lakin bu normaları poza bilən tolduran toy qadınları təsvir edərək, ozan üzünü oğuzlara tutaraq bu tipli qadınlar üçün xarakterik olan xüsusiyyətləri diqqətə çatdırır. Belə qadınlar sübh tezdən yerindən durur və evini-eşiyini səliqəyə salmadan el-obanı dolaşar və qeybət edər. Öz evində yığışıb oturmadığına görə isə evinin səliqəsi itər, evi göz görə-görə dağılıb gedər. Oğuz cəmiyyəti igid ərlərlə yanaşı, cəsur və qabiliyyətli qadınların çiyinləri üzərində qurulduğuna görə dedi-qodu ilə məşğul olaraq, ev-eşiyi ilə maraqlanmayan qadınlar da bu normalar sistemində qəbul olunmurlar. Odur ki, ozan Oğuz elinə belə qadınlardan da uzaq durmağı məsləhət görür.

Dastanın müqəddiməsində bayağı hesab olunan qadınlar da təsvir olunur. Bu qadınlar ərlərinin sözünü eşitməz, evə gələn qonağın qarşısına bişmiş isti yemək qoymaz və hər zaman işdən yayınmaq üçün bir bəhanələri vardır.

"Gəldik, ol kim, necə söylərsən, bayağıdır.. ötə yazıdan-yabandan bir udlu qonuq gəlsə ər adam evdə olsa, ana disə ki, dur ətmək gətir, yiyəlim, bu da yisün,. Disə bişmiş ətməgün bəqası olmaz, yimək gərəkdir, övrət aydar.. Neyləyəyim, bu yıqılacaq evdə un yoq, dəvə dəgirməndən gəlmədi – deyər.. Nə gəlürsə bənim sağrıma gəlsün deyü əlüyin... urur, yönin anaru, sağrısın ərinə döndürür. Bin söylərsən, birisini quymaz, -ərin sözini qulağma qoymaz... Andan dəxi sizi, xanım, Allah saqlasun! Ocağımıza buncılayın övrət gəlməsün" ("Kitabi-Dədə Qorqud", 1988: 33).

"Kitabi-Dədə Qorqud" dastanının ana xəttini təşkil edən, aparıcı rola malik olan ayrı-ayrı boylarında aktiv iştirak edən qadın obrazları da vardır. Belə qadınların bir neçəsi haqqında məlumat aşağıda verilmişdir.

*Burla xatun*

Bu obrazda türk qadınına məxsus igidlik, cəsurluq, ərinə sədaqət kimi keyfiyyətlər təcəssüm olunmuşdur. Dastanda o, sadəcə övladını sevən bir ana deyil, eyni zamanda qüdrətli Oğuz elinin mənəvi anasıdır. Həyat yoldaşı Qazan xanın ən yaxın silahdaşıdır. Döyüşdə Qazan xan yaralandıqda Burla xatun qılıncı əlinə alıb döyüşü qələbə qazanana qədər davam etdirir.

"Qazan xanın evinin yağmalanması boyu"nda Burla xatunun öz oğlu Uruzla mükaliməsi bir qadın olaraq onun hansı normaların daşıyıcısı olmasını aydın göstərir. Bu boyda Oğuz elinin qadınla bağlı düşüncələrinin şahidi oluruq. Uruzun dilindən diqqətə çatdırılan sözlərdən aydın olur ki, Oğuzda qadının ən böyük dəyəri onun ərinə sədaqəti ilə ölçülür.

Məhz onunla əlaqədardır ki, Uruz anası Burla xatuna üzünü tutaraq deyir: "Qo bəni qadın ana, çəngələ ursunlar, qo ətimdən çəksünlər, qara qovurma etsünlər, qırq bəg qızının öginə iletsünlər. Anlar bir yedigində sən iki yegil! Səni kafirlər bilməsünlər, tuymasunlar. Ta kim, sası dinlü kafirün döşəginə varmayasa, sağrağın sürməyəsən. Atam Qazan namusını sımayasan. Saqın! "–dedi" (Tahirzadə, 2015: 389).

Dastanın digər hissəsində "Uruz bəyin dustaq olduğu boy"da Burla xatunun analıq duyğuları, ana iztirabı təsvir edilir. O, Qazan xanın ovdan tək qayıtdığını görüb sarsılır və öz izdirablarını belə ifadə edir:

İgid bəyim Qazan!
Qalxıb yerindən sən durdun,
Oğlunla gözəl qara yallı Qazlıq atını mindin.
Boynu uzun vəhşi keyki vurub-yıxdın,
Sən atını yüklətdin geri döndün?
İki getdin, bir gəlirsən, balam hanı?

Qara dövranda tapdığım oğlum hanı?
Təkcə bəyim görünmür, bağrım yanır. (Kitabi-Dədə Qorqud, 1988: 73)

*Dəli Domrulun xanımı*

"Duxa Qoca oğlu Dəli Domrul" boyu daha çox ər-arvad münasibəti ilə diqqət çəkməkdədir. Dəli Domrul Tanrının göndərdiyi Əzrailə meydan oxuyur, bununla da o Tanrının qəzəbinə düçar olur və tanrı Əzrailə tapşırır ki, onun canını alsın. Dəli Domrul Əzrailə təslim olmaq istəmir. Səhvini başa düşüb Tanrıdan aman diləyir. Tanrı ondan can yerinə can istəyir. Dəli Domrul atasına, anasına bu sirri açır. Amma ata-anası öz şirin canlarından keçmirlər. Əzrailə tabe olmazdan əvvəl xatunu ilə halallaşmağa gəlir:

İndi uca-uca dağlarım yaylağın olsun!
Soyuq-soyuq sularım bulağın olsun!
Tövlə-tövlə şahanə atlarım sənin miniyin olsun!
Qızıl tağlı uca evim sənin kölgəliyin olsun!
Qatar-qatar dəvələrim sənin yüklüyün olsun!
Yaylaqdakı ağ qoyunum şülənliyin olsun!
Gözün kim tutarsa,
Könlün kimi sevərsə, ona ərə get!
İki oğlancığı öksüz qoyma! ("Kitabi-Dədə Qorqud", 1988: 82)

Dəli Domrulun qadını Əzrailin onun canını alacağını bildikdə ərinə belə deyərək canını ondan əsirgəmədiyini göstərir:

"... Qarşı yatan qara dağları,
Səndən sonra mən neylərəm?
Yaylayarsam, gorum olsun!
Soyuq-soyuq sularını mən içərsəm, mənim qanım olsun!
Qızılını-gümüşünü xərcləsəm, kəfənliyim olsun!
Səndən sonra bir igid sevib seçsəm,
Ərə getsəm, birgə yatsam, bu əjdaha ilan olub məni çalsın!
Qüdrətli Allah şahid olsun, qurbanam sana,
Mənim canım qurban olsun sənin canına!" ("Kitabi-Dədə Qorqud", 1988: 83)

Dəli Domrul ilə xatununun sevgisi tanrının da xoşuna gəlir. Dəli Domrulun səhvini bağışlayır. Burada da biz bir daha türk qadınının sevgisinə, həyat yoldaşına sədaqətinin, mərdliyinin şahidi oluruq. Dastanın bu boyunda qadına-anaya digər boylardan olmayan fərqli münasibətin də şahidi oluruq. Ananın öz övladına canını fəda etməməsi türk qadınına məxsus əlamət deyildi. Hətta bəzi tədqiqatçılar bu boyun sonradan əlavə edildiyini də iddia edirlər.

*Dirsə xanın xanımı*

Dirsə xanın xanımı obrazı mübarizliyi, əyilməzliyi ilə seçilən obrazlardandır. Dastanda qadınların vəsfedilmə hissələrində onların qəhrəmanlığından da xəbər alırıq. Aşağıdakı nəzm parçası buna nümunə ola bilər.

"Bəri gəl, başımın taxtı, evimin taxtı!
Evdən çıxıb yeriyəndə sərvi boylum!
Topuğuna sarmaşanda qara saçlım!
Qurulmuş yaya bənzər çatma qaşlım!
Qoşa badam sığmayan dar ağızlım!
Payız almasına bənzər al yanaqlım!" ("Kitabi-Dədə Qorqud", 1988: 35)

Dastanın "Dirsə xan oğlu Buğac" boyunda rast gəldiyimiz bu parçada biz türk qadınına olan yüksək münasibətin şahidi oluruq. Dastanda verilən parçadan bir türk qadınının xarici görünüşünün də təsvirini müəyyənləşdirə bilirik. Bu boyda eyni zamanda vətənə sevginin, ana haqqının Vətən

haqqına bərabər tutulduğunun da şahidi oluruq. Dirsə xanın xatunu ağır yaralanmış oğlu Buğacı ana südü, dağ çiçəyi ilə müalicə edir. Burada ana obrazı torpağa bağlılığın rəmzi kimi canlanır.

*"Salur Qazanın evinin yağmalanması boyu"*

Bu boyda evi yağmalanmış Qazan xan hər şeyi bir kənara qoyur, düşməndən ilk öncə anasını xəbər alır. Biz bu boyda bir daha Oğuz elində, türk dünyasında anaya, qadına qoyulan hörmətin, qadının-ananın bütün varlıqların ən müqəddəsi, ucası olduğunun bir daha şahidi oluruq. "Ana" obrazı tarixən də müqəddəs olub, bu gün də xalqımız üçün müqəddəsdir. T.Hacıyevin dediyi kimi ancaq oğulla ata mübahisələrində bir mülayim demokratizm görünür. Oğlan övladının qəhrəmanlığının erkən yaşlardan üzə çıxmaması Oğuz elində qəbahət sayılardı. Biz bunu "Salur Qazanın evinin yağmalandığı boy"da aydın şəkildə görürük. Belə ki, bir çox oğuz igidinin qəhrəmanlıq göstərib ad qazandığı bir zamanda Qazan xanın oğlu Uruzun ad qazanmaq məsələsinin gecikməsi atası Qazan xanı gileylənməyə vadar edir. Bunu görən Uruz atasına cavabında deyir: "Hünəri oğul atadanmı görər öyrənür, yoxsa atalar oğuldan öyrənür? Qaçan sən məni alub kafir sərhəddinə çıqardın, qılıc çalub baş kəsdin? Mən səndən nə gördüm nə öyrənüm?"

Bu epizodda iradını bildirməyi bacaran övladın özünə inamını, həm də valideynə böyük olduğu halda belə günahı ola biləcəyini demək cəsarətini görürük.

Türk ailəsində yaşlı valideynlərin də yeri, ağsaqqal və ağbirçəklərə münasibət xüsusi yer tutmaqdadır. Valideyn böyük hörmət sahibidir, ailə məsələlərinin həllində aparıcı mövqe tutmaqdadır. Oğuz elində yaşı ötmüş valideynlər T.Hacıyevin bildirdiyi kimi, valideynlər valideyni xüsusi qayğı ilə əhatə olunurlar. Onlar sözün əsil mənasında ağsaqqal, ağbircək olaraq müqəddəs sayılırlar. Tarixilik baxımından, dövlətçiliyin kamilliyinə dəlalət baxımdan valideynlər valideyni dövlət himayəsindədir.

Bundan başqa Oğuz ailəsində ər-arvad münasibəti də önəmli yer tutan, mühüm məsələlərdən biridir. Bu cür münasibətlərdə qadın qəhrəmanların göstərdiyi fədakarlıq ön planda verilməkdədir. Bununla yanaşı dastanın müxtəlif boylarında qadınların ərlərinə hörmətlə yanaşması, onlara böyük sevgi və etibar nümayiş etdirməsini görürük. Buna nümunə olaraq "Dirsə xan oğlu Buğac xan boyu"nda Xatununun Dirsə xana müraciətinə nəzər salaq:

"Xan babamın göygüsi
Qadın anamın sevgisi
Atam anamın verdigi
Göz açuban gördügüm
Könül verib sevdigim" ("Kitabi-Dədə Qorqud", 1988: 38)

Dastanda ərlə arvadın bir-birinə "başım baxtı", "evim taxtı" deyə xitab etmələrinə tez-tez rast gəlirik. Bu müraciət formasını Dirsə xanın, onun xatununun, Qazan xanın, Burla xatunun dilindən oxuyuruq. Ər qadının başının baxtı, yəni ailəsinin dayağı, səltənəti bilir, qadın da ərini. Bu təşbehdə türk ailəsinin varlığında ər və qadın bərabərliyi təsdiqlənir (İsmiyeva, 2015: 321).

Ailədə ər-arvad münasibətlərinin daha fərqli nümunəsinə "Duxa Qoca oğlu Dəli Domrul boyu"nda rast gəlirik. Bu boyda azad məhəbbət, istək, ailə sevgisi ər-arvad çərçivəsində qoyulur və həll olunur. Bu boyda sevgi, məhəbbət, ər-arvad münasibətləri sözün əsl mənasında zirvəyə qalxır, Tanrı səviyyəsinə yüksəlir. Arvadı öz canını Dəli Domrul üçün fəda etməyə hazır olduğunu, can əvəzinə can vermək motivini görürük. Bu boy türk xalqlarına xas olmayan bir xüsusiyyəti ilə də diqqət çəkir: valideyn öz canını övladı üçün fəda etmir. Bu boy daha qədim tarixə, yəni İslamdan öncəyə aid hesab olunur.

Dastandakı önəmli faktlardan biri də Oğuzlarda ərlə arvadın qurduqları evliliyi davametdirmə məsələsində qadının üzərinə düşən vəzifədir. Dastandan aydın olur ki, ər itkin düşərsə və ya müharibədə əsir alınarsa onun haqqında sağ olub-olmaması xəbəri məlum olmayınca qadın yoldaşını gözləməlidir. Bunu dastanın "Baybörə oğlu Bamsı Beyrək boyu"nda görürük. Boyda verilir ki, Bamsı Beyrək 39 igid ilə əsir götürülür.

Hadisə belə qarşılanır: Xanımı "Banuçiçək qaralar geydi, ağ qaftanını çıqardı… Beyrəgün yar-yoldaşları ağ çıqarub qaralar geydilər. Qalın Oğuz bəgləri Beyrək üçün əzim yas tutdular." – bu, Oğuz elinin milli yası deməkdir. Ailə səviyyəsində bu yas 16 il davam edir. Bu müddətdə nə Banuçiçək ərə getmək barəsində düşünür, nə də kimsə onunla evlənmək, ona elçi göndərmək niyyətində olur. Ancaq 16 il tamam olanda Banuçiçəyin qardaşı Dəli Qarcar xanlar xanı Bayandurun hüzuruna gəlib diz çökür və deyir ki, diri olsa, bu 16 ildə Beyrəkdən bir xəbər çıxardı. Görünür, etik ayinə uyğun olaraq belə şərt söyləyir: "Bir yigit olsa, dirisi xəbərün gətirsə, altun-aqça verərdim. Ölüsü xəbərini gətirənə qızqardaşım verərdim" (Hacıyev, 1999: 102-103). Buradan belə nəticəyə gəlirik ki, 16 il keçsə də diri xəbəri gələrsə qadın yoldaşını yenə də gözləməlidir. Amma öldü xəbəri gələrsə, ölənin qadını ərə getməlidir. Oğuz elində əxlaq normasına görə ərsiz qadın ailə qurmalıdır. Bunun səbəbi adını pis dedi-qodulardan qorumaqdır. Ölən igidin qadını elə igid, mərdə qismət olmalıdır.

Tariximizin dərin qatlarını özündə əks etdirən Kitabi-Dədə Qorqud dastanımızda yer alan ailə münasibətləri özünün bir çox xüsusiyyətləri ilə bugünümüzdə də aktualdır.

Dastanda xüsusi vurğulanmalı olan məsələlərdən biri də qadının başqa dinin nümayəndəsi olmasına baxmayaraq, igidliyinə, mərdliyinə, sədaqətinə önəm verilməsidir. Buna "Qanlı Qoca oğlu Qanturalı" boyundan nümunə gətirə bilərik.

Boyda Qanturalının evlənməsini məsləhət görən atası Qanlı Qocaya Qanturalı məhz belə cavab verir: "Baba, mən yerimdən durmadan ol durmuş ola! Bən qaraquc atımı binmədən ol binmiş ola!" (İsmayılova, 2018).

Qanturalının ailə qurduğu Selcan xatun kimdir? Trabzon təkurunun qızı.

O vaxtlar Trabzon bir xristian şəhəri idi. Amma atasını və Qanturalının özünü bu məqam qətiyyən narahat etmir. O cəsarətlə Trabzona yollanır, yolunda duran bütün maneələri qızın özünün köməyi ilə dəf edir, Trabzon bəyinin qızını elə öz istəyiylə alır və qayıdıb evinə gəlir. Selcan xatun kimdir? O dövr üçün uzaq və yabancı məkan olan Trabzon təkurunun qızıdır. Kafir qızıdır. Yəni başqa dinin daşıyıcısına məhəbbət dolu münasibətini Qanturalı bir dastan qəhrəmanı olaraq çəkinmədən və heç kimdən ehtiyyat etmədən ortaya qoyur (Kamal, 2020: 38).

Eposda vətənpərvərlik hisslərinin tərbiyəsindən, oğuz ərənlərinin igid türk oğlu kimi yetişməsindən danışarkən mərd türk qadınlarının danılmaz rolu olduğunun bir daha şahidi oluruq. Dastandakı qadın obrazlarının əksəriyyəti qurşaq tutur, ox atır, ov ovlayır, oğuz elinin dar günündə ərləri ilə yanaşı döyüşlərdə iştirak edirlər (Əzimova, 2015: 264).

Dastanda hər igidin bir xanımı olar fikrinin də sübutunu görürük. Belə ki eposda çoxarvadlılıq faktı qeyd olunmayıb.

Möhkəm ailə telləri, möhkəm ailə dayaqları, ər-arvad, valideynlərlə uşaqlar arasında qarşılıqlı hörmət, məhəbbət və ehtiram münasibətləri haqqında ideya bütün eposdan qızıl xəttlə keçir (Məlikova, 2004: 71).

## Nəticə

"Kitabi-Dədə Qorqud" dastanında gender bərabərliyi, dini tolerantlıq, ailə münasibətləri, müxtəlif xalqların birgə əmin-amanlıq içində yaşamasını əks etdirən boyları nəzərdən keçirdikdə dastanın hansı multikultural dəyərlərə sahib olduğunu görmüş oluruq. Xüsusilə, gender münasibətlərini, özündə bədii şəkildə əks etdirən "Kitabi-Dədə Qorqud" dastanında qadın ana obrazında, qəhrəmanın ömür-gün yoldaşı kimi, müxtəlif ritualların iştirakçısı olaraq təqdim olunur. Müqəddimədə qadınlar barədə deyilmiş fikirlərə nəzər salmaqla Oğuz elində qadına verilən dəyəri aydınlaşdırmış, qadının cəmiyyətdəki vəzifəsi və mövqeyi barədə deyilən faktların hətta bu günün özündə belə öz qüvvəsini saxladığını görmüş oluruq. Odur ki, "Kitabi Dədə Qorqud"un müqəddiməsində qadınla bağlı əks olunan fikirləri təkcə sözügedən dastanın məlumatı kimi yox, bütövlükdə türk etnomədəniyyətinin qadına münasibəti kimi anlamaq məqsədəuyğundur.

Oğuz elində müqəddəs hesab edilən, kiçik dövlətə bənzədilən ailə anlayışının hər bir fərdinin cəmiyyətin bir üzvü olaraq və ailədəki qayda-qanun və tərbiyənin bilavasitə cəmiyyətə, cəmiyyətin inkişafına necə təsir etməsiylə bağlı məlumat əldə etmiş oluruq. Dastanın boylarını incələdikdə Oğuzlarda yaşlı valideynlərin yerinin, ağsaqqal və ağbirçəklərə münasibətin xüsusi önəm daşıdığını öyrəndik. Burada valideyn böyük hörmət sahibidir, ailə məsələlərinin həllində aparıcı mövqe tutmaqdadır. Oğuz elində yaşı ötmüş valideynlər T.Hacıyevin bildirdiyi kimi, valideynlər valideyni xüsusi qayğı ilə əhatə olunurdu. Bundan başqa Oğuz ailəsində ər-arvad münasibəti də önəmli yer tutan, mühüm məsələlərdən biri olub. Bu cür münasibətlərdə qadın qəhrəmanların göstərdiyi fədakarlıq ön planda verilməkdədir.

## Ədəbiyyat


1. Milli-mənəvi dəyərlərimizə, xalqımızın çoxəsirlik tarixinə hörmət, ehtiram bayramı. (2000). Respublika sarayında "Kitabi-Dədə Qorqud" dastanının 1300 illiyinə həsr olunmuş təntənəli yubiley mərasimində Azərbaycan Prezidenti Heydər Əliyevin nitqi. "Azərbaycan" qəzeti, 11 aprel.
2. Kitabi-Dədə Qorqud. (1988). Bakı: Yazıçı.
3. Tahirzadə, G. (2015). "Kitabi-Dədə Qorqud" dastanında gender. "Kitabi-Dədə Qorqud" və Türk dünyası beynəlxalq elmi konfrans materialları. Bakı, s.388-391.
4. İsmiyeva, L. (2015). "Kitabi-Dədə Qorqud" da ailə münasibətləri. "Kitabi-Dədə Qorqud" və Türk dünyası beynəlxalq elmi konfrans materialları. Bakı, s.320-322.
5. Hacıyev, T. (1999). Dədə Qorqud: dilimiz, düşüncəmiz. Bakı: Yeni Nəşrlər Evi, Elm nəşriyyatı.
6. İsmayılova.M. "Kitabi-Dədə Qorqud dastanı"nda multikultural dəyərlər. https://nuhcixan.az/news/cemiyyet/8677-kitabi-dede-qorqud-dastaninda-multikultural-deyerler
7. Kamal, A. (2020). Azərbaycançılıq və Kitabi-Dədə Qorqud dastanı. ADA.
8. Əzimova, A. (2015). "Kitabi-Dədə Qorqud dastanı"nda qadına münasibət. "Kitabi-Dədə Qorqud" və Türk dünyası beynəlxalq elmi konfrans materialları. Bakı, s.262-265.
9. Məlikova, M. (2004). Dədə Qorqud kitabında dövlət və hüquq haqqında ideyalar. Dədə Qorqud dünyası. Bakı: Öndər, 240 s.


Göndərilib: 03.09.2022 Qəbul edilib: 10.10.2022

DOI: https://doi.org/10.36719/2706-6185/16/25-31

**Fərid Orucəli oğlu Əliyev**
Azərbaycan Turizm və Menecment Universiteti
magistrant
eliyevf2405@gmail.com

# "AĞILLI ŞƏHƏR" VƏ "AĞILLI KƏND" SALMANIN BEYNƏLXALQ TƏCRÜBƏSİ

**Xülasə**

Məlumdur ki, kəndlərdən şəhərlərə artan miqrasiya nəticəsində şəhərlər bir çox fərqli problemlərlə üzləşirlər. Bu problemlərə əsas tələbat gündəlik məişət təlabatlarının kəskin çatışmazlığı, ekoloji böhranlara və kritik həddə çatan çirklənmə səviyyəsi daxildir.

"Ağıllı Şəhər" və "Ağıllı Kənd" layihələri insanların həyat keyfiyyətinə təsir göstərir. Xüsusilə "Ağıllı kənd" sistemi kənd yerlərində uzaqlıq və əhalinin sıxlığı ilə bağlı yaranan maneələrin aradan qaldırılmasına şərait yaradır. "Ağıllı kənd" layihələrində bölgənin iqtisadi imkanlarının, infrastrukturunun, orada göstəriləcək xidmətlərin və idarəetmə sisteminin yaxşılaşdırılması, yeni imkanların yaradılması nəzərdə tutulur. Bu layihələr informasiya-kommunikasiya texnologiyalarının (İKT) potensialından tam istifadəyə əsaslanır. İKT "Ağıllı şəhər" təşəbbüslərinin əsas hərəkətverici qüvvəsidir.
***Açar sözlər:*** *Ağıllı şəhər, Ağıllı kənd, layihə, miqrasiya, mobil əlaqə, İKT*

**Farid Orujali Aliyev**
Azerbaijan University of Tourism and Management
master
eliyevf2405@gmail.com

## International experience of "Smart village" and "Smart city" planning

**Abstract**

It is known that many different difficulties are experienced in cities as a result of increasing migration from rural to urban areas. These problems include severe shortages of basic household goods, environmental crises, and pollution levels reaching critical levels.

"Smart city" and "Smart village" projects affect the quality of life of citizens. In particular, the "smart village" system creates conditions for eliminating obstacles caused by long distance and population density in rural areas. The "Smart Village" projects envisage the improvement of the region's economic opportunities, infrastructure, services and management system, and the creation of new opportunities. These projects are based on the full use of the potential of information and communication technologies (ICT). ICT is the main driving force of Smart City initiatives.
***Keywords:*** *Smart city, Smart village, project, migration, mobile communication, ICT*

## Giriş

"Dəmir dövründən" başlayaraq insan davamlı olaraq bütün istehsal vasitələrindən istifadə etməyə çalışaraq, bacarıqlı manipulyator olmağa çalışmışdır. İnsanın təkamülü ilə kənd təsərrüfatından kapitalizmə, sənayeləşməyə və əməyin ixtisaslaşmasına qədər olan inkişaf müasir böyük şəhərlərin meydana gəlməsinə səbəb oldu ki, bu da öz növbəsində ətraf mühitdə həm müsbət, həm də arzuolunmaz effektlərin təzahür olunması ilə nəticələndi. Sosial-iqtisadi artımın görünməmiş bir sürətlə inkişaf etməsi və həyata keçirilən fəaliyyətlər ekoloji zəhətdən böyük dərəcədə ziyanlara gətirib çıxardı. İnsanlar sosial-maddi imkanlarını genişləndirmək, təhsil almaq məqsədilə şəhərlərə köçürlər. Statistikaya əsasən söyləmək olar ki, son 30 ildə hər il dünyada şəhər əhalisinin sayı orta hesabla 65 milyon artmışdır.

2014-cü ilə qədər dünyada 28 böyük şəhər var idi. Bu şəhərlərdə 453 milyon insan yaşayırdı. Dünya əhalisinin 54% hal-hazırda şəhər yerlərində yaşayır. Getdikcə kənddən şəhərələ doğru miqrasiya artımının nəticəsi olaraq şəhərlərdə bir çox müxtəlif çətinliklər yaşandığı məlumdur. Bu problemlərə əsas məişət vasitələrinin ciddi çatışmazlığı, ekoloji böhranlar, çirklənmə səviyyəsinin kritik həddə çatması daxildir. Onsuz da köhnə infrastrukturdan əziyyət çəkən şəhərlər bir də sürətli urbanizasiyanın yaranmış olduğu problemlərlə qarşılaşmış olur. Şəhərlərdə bu çirklənmələrin sonrakı illərdə də bu templə davam edəcəyi proqnozlaşdırılır. 2050-ci ilə qədər dünya şəhər əhalisinin ümumi nisbətinin 66%-ə yüksələcəyi gözlənilir. Şəhərlərə bir qayda olaraq ölkənin ümumi daxili məhsulu adətən 75-80%-ə qədəri daxil olur və bu ölkə iqtisadiyyatının inkişaf etdirici qüvvəsi hesab olunur. Həmçinin dünya üzrə tullantılarının 50%-i, istixana qazı emissiyalarının 60%-i şəhərlərin payına düşür.

Təbiətdə suya, torpağa və təbii yanacaq ehtiyatlarına təzyiqin artımı müşahidə edilir. Hazırda şəhərlərdə bu kimi çətinliklər özünü nəqliyyat infrastrukturunun təminatınada adekvat səhiyyə xidmətinin təşkil olunmasında, təhsilin əlçatanlığında, ümumi şəhər əhalisinin təhlükəsizliyinin təmin edilməsi sahəsində də göstərir.

Şəhərlərlə maraqlı olan tərəflər iki qarşıdurma qarşısında qalırlar: ya onlar şəhərləri iqtisadiyyatın inkişafında aparıcı qüvvə kimi təbliğ etməli, ya da artan əhalinin təbii resurslardan istifadəsi və onlardan asılılıq probleminə diqqəti yönəltməlidirlər. Məhz bu məqsədlə BMT-nin fəaliyyət göstərən İşçi qrupu şəhərlərin davamlılığını artırmaq məqsədilə qarşılarına “Ağıllı şəhər” salmanın təşkilinə nail olmaq məsələsini həllinə nail olmağı qoymuşdur.

Ağıllı Davamlı Şəhərlər on ildən çox əvvəl yaranmış bir anlayışdır. O, şəhər idarəetmə sistemlərində informasiya-kommunikasiya texnologiyalarının (İKT) potensialından tam istifadəyə əsaslanır. Onun əsasında təkcə müasir şəhərlərin salınmasında deyil, həm də şəhərlərin idarəetmə sistemlərində informasiya-kommunikasiya texnologiyalarının (İKT) sosial-iqtisadi sahə potensialından tam istifadəsinə və ekoloji davamlılığın təşkilinə nail olmasına əsaslanır. Hər bir “Ağıllı şəhər” layihəsinin həyata keçirilməsinə onun hazırkı mövqeyinə əsaslanaraq yol götürərək başlamaq olar.

Digər dünya ölkələrində iqtisadiyyatın yüksək templə inkişafı insanların kəndlərdən şəhərlərə miqrasiyasını sürətləndirməsi şəhərsalma layihələrinin “sıfır”dan başlayaraq təşkil olunmasına zəmin yaratmışdır. Şəhər salma və kənd salma layihələrinin zamana, tələbata uyğun təşkili ilə kiçik kəndlərin şəhərlərə, şəhərlərin isə iri şəhərlərə qədər inkişafına nail olmaq olar.

Şəhərsalma işlərinin təşkili zamanı belə bir sual yaranır: “Yeni salınacaq şəhər üçün İKT infrastrukturu necə planlaşdırılmalıdır ki,o həm "ağıllı", həm də "davamlı" olsun?

“Ağıllı davamlı şəhər” innovativ şəhərdir. Bu şəhəri təşkil edərkən İKT və digər vasitələrdən istifadə elə təşkil edilməlidir ki, şəhər indiki və gələcək nəsillərin ehtiyaclarına cavab verən, iqtisadi, sosial və ekoloji aspektlərdə rəqabətə dayanıqlı mühitin formalaşdırılmasına nail olunsun.

Yeni bir şəhərin layihələşdirilməsi İKT infrastrukturu ilə inteqrasiya olunmuş yüksək dizayna və geniş kompleksli imkanlara malik unikal planlaşmanın təşkilinə imkan yaranır. Planlaşdırma mərhələsi başa çatdıqdan sonra, İKT sahələri mövcud spesifikasiyalar və standartların bütün əhatə dairəsi uyğun xüsusiyyətlərə əsaslanaraq hazırlanmalıdır. Bu yanaşma şəhər və ya şəhər sahəsinin yeraltı və ya yeraltı tikililərin olmadığıərazilərdənəzərdə tutulur. Bununla təmir xidmətləri üçün əlavəxərclərə qənaət edilmişolar.

Bəziləri “ağıllı şəhər” terminini sırf şəhər fenomeninin etiketlənməsi üsulu kimi tanıyaraq, “ağıllı şəhər” etiketinin bir konsepsiya olduğunu və həmişə ardıcıl olaraq istifadə olunmadığını qeyd edir. Aşağıda elmi, tətbiqi və təhsil məqsədləri olan və konsepsiyanı müxtəlif nöqteyi-nəzərdən təsvir edən materiallarda tapıla bilən bir neçə iş tərifinin xülasəsi verilmişdir.

Ağıllı şəhərin işlənən təriflərinin xülasəsi:

1) Elmi tərəfdən yanaşma:

“Ağıllı şəhər davamlı iqtisadi artımı və yüksək həyat keyfiyyətini stimullaşdıran sensorlar, elektronika və şəbəkələrin qabaqcıl infrastrukturu ilə gələcəyin təhlükəsiz, ekoloji cəhətdən təmiz (yaşıl) və səmərəli şəhər mərkəzidir”.

"Şəhər o zaman ağıllı olacaq ki, insan və sosial kapitala, ənənəvi (nəqliyyat) və müasir (İKT) kommunikasiya infrastrukturuna investisiyalar dayanıqlı iqtisadi artımı və yüksək həyat keyfiyyətini təmin etmək səviyyəsində inkişaf etmiş olsun. Bu investisiyalar təbii resursların müdrik idarə olunması şəhər rəhbərliyinin iştirakı ilə dəstəklənməlidir.

"Bu, iqtisadiyyatın inkişafını, insan kapitalını, şəhər idarəçiliyini, mobillik infrastrukturunu, ətraf mühitin mühafizəsini və həyat keyfiyyətini strateji cəhətdən quran və həyata keçirən bir şəhərdir. Bu cür inkişaf kapital və məlumatlı, azad qərarlar verən vətəndaşların fəaliyyətinin ağıllı birləşməsinə əsaslanır (Ferrara, 2015: 4724-4734).

2) İqtisadi baxımdan yanaşma:

"Ağıllı şəhər insanları, məlumatları və şəhər infrastrukturunun elementlərini birləşdirən qabaqcıl və yüksək texnologiyalı şəhərdir. O, sadə şəhər idarəetmə və texniki xidmət sisteminə malikdir olub, davamlı həyati keyfiyyətə malik yaşıl şəhər formalaşdırmaq (ətraf mühitin mühafizəsinin yaxşılaşdırılması), rəqabətli, innovativ ticarət və yeni texnologiyalardan istifadə edir" (Gil-Garcia, Pardo, Nam, 2015: 61-87).

"İqlim dəyişikliyi ilə mübarizə məqsədlərinə çatmaq üçün Amsterdam ağıllı bir şəhər olaraq innovativ texnologiyalardan və sakinlərin enerji istehlakı baxımından davranışlarını dəyişmək istəyindən istifadə edir. Buna uyğun olaraq, Amsterdam inkişaf proqramı iqlim dəyişikliyinin dizaynı və tikintisinə universal yanaşma həyata keçirir. Karbon izini azaldan davamlı, iqtisadi cəhətdən əlverişli şəhər reallaşdırılır" (Kramers, Hojer, Lovehagen, Wangel, 2014: 52-62).

3) İnformasiya texnologiyaları baxımından yanaşma:

"Şəhər infrastrukturunun kritik komponentlərini və xidmətlərini daha ağıllı, bir-biri ilə əlaqəli və səmərəli etmək üçün ağıllı hesablama texnologiyalarından istifadə nəzərdə tutulur. Şəhər komponentləri və xidmətlərinə aşağıdakılar daxildir: şəhər rəhbərliyi, təhsil, səhiyyə və ictimai asayiş sistemləri, şəhər daşınmaz əmlakı, nəqliyyat infrastrukturu və sistem kommunal xidmətləri".

"Ağıllı şəhər onun çoxlu sayda müxtəlif alt sistemləri arasında axan intellektual məlumat mübadiləsinə əsaslanır. Şəhər bu məlumat axınını təhlil edir və vətəndaşlar, şirkətlər üçün xidmətlərə çevirir. Ağıllı şəhər resurs xərcləri baxımından davamlı və qənaətcil olub, öz ekosistemini daha da gücləndirəcək şəkildə emal edir. Məlumat mübadiləsi davamlı şəhər inkişafı üçün nəzərdə tutulmuş ağıllı əməliyyat idarəetmə modelinə əsaslanır" (Li, Qiao, Sun, Wan, Wang, Xia, Zhang, 2010: 168-177).

Ağıllı şəhər yaşayış məntəqəsinin (rayon, şəhər, rayon və ya kiçik ölkənin) inzibati vahididir və onun (inzibati vahidin) davamlı iqtisadi inkişafını təmin etmək üçün real vaxt rejimində informasiya texnologiyalarından istifadəyə vahid yanaşma tətbiq edilir" (www.ibm.com).

İdarəetmə konsaltinqində dünya nəhənglərinin (Böyük Dördlük, IBM, McKinsey, Microsoft və s.) metodlarında qeydə alınmış insan fəaliyyətinin müxtəlif sahələrində informasiya sistemlərinin yaradılması üzrə dünya təcrübəsi onu deməyə əsas verir ki, ağıllı şəhər (bina) yaratmaq üçün istənilən təşəbbüs sıfırdan "təmiz sahədə" və ya mövcud "ağıllı olmayan" şəhərin ağıllıya və ya ağıllı şəhərin daha ağıllıya (daha ağıllı) çevrilməsi aşağıdakı sənədlər toplusu ilə müşayiət olunmalıdır (www.cpspwg. org):

- Ağıllı şəhər təşəbbüsünün çərçivəsi (Çərçivə)
- Ağıllı şəhər memarlığı (Memarlıq)
- Ağıllı şəhər təşəbbüsünə hazırlığın qiymətləndirilməsi (Ağıllı şəhər hazırlığının qiymətləndirilməsi)
- Ağıllı şəhərin həyata keçirilməsinin yetkinlik səviyyəsinin qiymətləndirilməsi (Smart city maturity)
- Ağıllı şəhərin yaradılması üçün yol xəritəsi (Ağıllı şəhərin yol xəritəsi)

Kanada, ABŞ və Meksikadan olan beynəlxalq alimlər qrupu müxtəlif elm sahələrinə aid çoxlu ədəbiyyatın (43 adda) öyrənilməsinə əsaslanaraq (www.itworldcanada.com) ağıllı şəhərin məzmununu formalaşdırılmasına təşəbbüs göstərən səkkiz kritik faktor klasterini müəyyən etmişlər:

- idarəetmə və təşkili;
- İKT texnologiyaları;
- idarəetmə;
- siyasi kontekst;

